Tərcümə etdi: İdris Hüseynzadə

Redaktor: Fərid Abdulla

Korrektor: 313news.net



---

MÜNDƏRİCAT

Rəhman və Rəhim Allahın adı ilə

Həmd aləmlərin Rəbbi və bütün məxluqatın Yaradanı olan Allaha məxsusdur. Aləmlərə rəhmət olaraq göndərilən Muhəmməd ibn Abdullaha, onun pak və təmiz Əhli-Beytinə, həmçinin Muhəmməd və Ali-Muhəmmədin yoluna tabe olan şəxslərə Qiyamət gününədək salavat və salam olsun. Onların bütün düşmənlərinə Qiyamət gününə qədər daimi və əbədi lənət olsun.

Əhli-Beytdən olan on iki pak İmam *(əleyhimussəlam)* ali İslam şəriəti, onun hökm və təlimlərinə, habelə Qurani-Kərim, onun ayələrinin təfsiri, izahı və mənalarına insanlar arasında hamıdan çox agahdırlar. Onlar bir çox həqiqətlərə vaqif olmuş, siyasi, iqtisadi, ictimai, tibbi, tarixi və s. bu qəbil elmləri bilmiş, hətta bilinməsi yalnız qeyb yolu ilə mümkün olan bir sıra işlərdən xəbər vermişlər. Bununla yanaşı, tarixdə imamların *(əleyhimussəlam)* hansısa bir alimin yanında dərs alması da qeyd edilməmişdir.

Onlar sadalanan bütün bu şeyləri "lədunni elm" [1] vasitəsilə bilmişlər. Bu elmi isə aşağıda göstərilən yollarla əldə etmişlər.

[1] "Lədunni elm": Allah tərəfindən öyrədilən və ya əta edilən elmdir. [Müt.]

## Pak imamlar (əleyhimussəlam) Allah Rəsulunun (sallallahu əleyhi və alihi və səlləm) elminin varisləridir

İmamlar (əleyhimussəlam) sahib olduqları elmləri Allah Rəsulundan (sallallahu əleyhi və alihi və səlləm) şifahi və ya yazılı yolla irs almışlar. Belə ki, Əmirəlmöminin (əleyhissəlam) Allah Rəsulundan (sallallahu əleyhi və alihi və səlləm) çoxlu sayda elm öyrənmişdir. Allah Rəsulu (sallallahu əleyhi və alihi və səlləm) da bu elmləri vəhy yolu ilə Allahdan (əzzə və cəll) əxz etmişdir. Sünni alimlərdən Hakim Nişapuri "əl-Müstədrək ələs-səhiheyn" kitabında İbn Abbasdan öz sənədi ilə belə nəql etmişdir ki, Allah Rəsulu (sallallahu əleyhi və alihi və səlləm) buyurmuşdur:

أنا مدينة العلم وعلي بابها، فمن أراد المدينة فليأت الباب.

"Mən elmin şəhəri, Əli isə bu şəhərin qapısıdır. Şəhərə gəlmək istəyən kəs, qapıya gəlməlidir" .

Bunun ardınca Hakim demişdir:

هذا حديث صحيح الإسناد ولم يخرجاه.

"Bu, səhih sənədli hədisdir, lakin onlar (Buxari və Müslim) bu hədisi öz kitablarında nəql etməmişlər".[2]

Tirmizi "əl-Camius-Səhih" kitabında Əmirəlmöminin Əli ibn Əbu Talibdən (əleyhissəlam) öz sənədi ilə belə nəql etmişdir ki, Allah Rəsulu (sallallahu əleyhi və alihi və səlləm) buyurmuşdur:

أنا دار الحكمة وعلي بابها

"Mən hikmət evi, Əli isə bu evin qapısıdır".[3]

Şiə alimlərindən Şeyx Səduq səhih sənədlə[4] belə nəql etmişdir:

حدثنا أبي ومحمد بن الحسن وأحمد بن محمد بن يحيى العطار رضي الله عنهم قالوا: حدثنا سعد بن عبد الله، عن يعقوب بن يزيد، عن محمد بن أبي عمير، عن مرازم بن حكيم الأزدي، عن أبي عبد الله عليه السلام قال: علّم رسول الله صلى الله عليه وآله علياً عليه السلام ألف باب يفتح كل باب ألف باب.

"Mənə atam, Muhəmməd ibn Həsən və Əhməd ibn Muhəmməd ibn Yəhya əı-Əttar (Allah onlardan razı olsun) nəql edib dedilər: "Səd ibn Abdullah bizə

---

[2] "Əl-Müstədrək ələs-səhiheyn", c.3, səh.137, №4637; "Tarixu-Bağdad", c.11, səh.49; "Tarixu-Diməşq", c.42, səh.380. "Təhzibul-kəmal" kitabında (c.18, səh.77) belə deyilir: *"Qasim dedi: Yəhya ibn Məindən bu hədis barədə soruşdum, dedi: "Səhihdir."*

[3] "əl-Camius-səhih" ("Sünənut-Tirmizi"), c.5, səh.637, №3723.

[4] "Səhih hədis" nəql edən şəxslərinin hər birinin on iki imam məzhəbindən olan və etibarlı sayılan hədisə deyilir.

Yaqub ibn Yeziddən, o, Muhəmməd ibn Əbu Ümeyrdən, o, Mərazim ibn Həkim əl-Əzdidən, o da Əbu Abdullah əs-Sadiqdən (əleyhissəlam) nəql edib dedi:

"Allah Rəsulu (sallallahu əleyhi və alihi və səlləm) Əliyə (əleyhissəlam) hər biri min qapı açan min qapı[5] öyrədib".[6]

Həmçinin Şeyx Səduqun müvəssəq sənədlə[7] nəql etdiyi başqa bir hədisdə deyilir:

حدثنا أبي ومحمد بن الحسن وأحمد بن محمد بن يحيى العطار رضي الله عنهم، قالوا: حدثنا سعد بن عبد الله، عن أحمد بن محمد بن عيسى وإبراهيم بن هاشم، عن الحسن بن علي بن فضال، عن أبي المعزا حميد بن المثنى العجلي، عن ذريح بن محمد بن يزيد المحاربي قال: سمعت أبا عبد الله عليه السلام يقول: «نحن ورثة الأنبياء» ثم قال: «جلل رسول الله صلى الله عليه وآله على علي عليه السلام ثوباً ثم علّمه ألف كلمة كل كلمة يفتح ألف كلمة.»

"Bizə atam, Muhəmməd ibn Həsən və Əhməd ibn Muhəmməd ibn Yəhya Əttar (Allah onlardan razı olsun) nəql edib dedilər: "Bizə Səd ibn Abdullah Əhməd ibn Muhəmməd ibn İsa və İbrahim ibn Haşimdən, onlar Həsən ibn Əli ibn Fəzzaldan, o, Əbul-Məza Həmid ibn əl-Musənna əl-İclidən, o da Zureyh ibn Muhəmməd ibn Yezid əl-Məharibidən nəql edib dedi: Əbu Abdullahın (İmam Sadiqin) (əleyhissəlam) belə dediyini eşitdim:

"Biz, peyğəmbərlərin varisləriyik." Sonra dedi: "Allah Rəsulu (sallallahu əleyhi və alihi və səlləm) Əliyə (əleyhissəlam) bir (elm) libas(ı) geyindirdi, sonra ona hər biri min söz açan min söz öyrətdi".[8]

Siqətül-İslam Şeyx Kuleyninin səhih sənədlə nəql etdiyi bir hədisdə isə deyilir:

عدة من أصحابنا، عن أحمد بن محمد، عن عبد الله بن الحجال عن أحمد بن عمر الحلبي، عن أبي بصير قال: دخلت على أبي عبد الله عليه السلام فقلت له: جعلت فداك إني أسألك عن مسألة، ههنا أحد يسمع كلامي؟ قال: فرفع أبو عبد الله عليه السلام ستراً بينه وبين بيت آخر فأطلع فيه ثم قال: يا أبا محمد سل عما بدا لك، قال: قلت: جعلت فداك إن شيعتك يتحدثون أن رسول الله صلى الله عليه وآله علم علياً عليه السلام باباً يفتح له منه ألف باب؟

[5] Qapı deyildikdə, elm qapısı nəzərdə tutulur. [Müt.]

[6] "Əl-Xisal", səh.648. Bu hədisi Səffar da "Bəsairud-dərəcat"da (səh. 286) səhih sənədlə nəql etmişdir.

[7] "Müvəssəq hədis": nəql edən şəxslərin hər birinin güvənilir sayılan, lakin hamısı və ya bəzisinin on iki imam məzhəbindən olmayan hədisə deyilir. Bu hədisin sənədində Həsən ibn Əli ibn Fəzzal olduğuna görə müvəssəq sayılmışdır. Çünki Həsən ibn Əli ibn Fəzzal vaqifi məzhəbindən olmuşdur. Əlbəttə, onu da qeyd etmək lazımdır ki, bəzi alimlər Həsən ibn Əlinin vaqifi olmadığını demişlər.

[8] "Əl-Xisal", səh.650-651.

قال: فقال: يا أبا محمد علم رسول الله صلى الله عليه وآله علياً عليه السلام ألف باب يفتح من كل باب ألف باب .

قال: قلت: هذا والله العلم قال: فنكت ساعة في الأرض ثم قال: إنه لعلم وما هو بذاك.

قال: ثم قال: يا أبا محمد وإن عندنا الجامعة وما يدريهم ما الجامعة؟ قال: قلت: جعلت فداك وما الجامعة؟ قال: صحيفة طولها سبعون ذراعاً بذراع رسول الله صلى الله عليه وآله وإملائه من فلق فيه وخط علي بيمينه، فيها كل حلال وحرام وكل شيء يحتاج الناس إليه حتى الأرش في الخدش وضرب بيده إلي فقال: تأذن لي يا أبا محمد؟ قال: قلت: جعلت فداك إنما أنا لك فاصنع ما شئت، قال: فغمزني بيده وقال: حتى أرش هذا –كأنه مغضب –.

قال: قلت: هذا والله العلم.

قال إنه لعلم وليس بذاك. ثم سكت ساعة، ثم قال: وإن عندنا الجفر وما يدريهم ما الجفر؟

قال قلت: وما الجفر؟

قال: وعاء من أدم فيه علم النبيين والوصيين، وعلم العلماء الذين مضوا من بني إسرائيل.

قال قلت: إن هذا هو العلم، قال: إنه لعلم وليس بذاك. ثم سكت ساعة ثم قال: وإن عندنا لمصحف فاطمة عليها السلام وما يدريهم ما مصحف فاطمة عليها السلام؟

قال: قلت: وما مصحف فاطمة عليها السلام؟

قال: مصحف فيه مثل قرآنكم هذا ثلاث مرات، والله ما فيه من قرآنكم حرف واحد.

قال: قلت: هذا والله العلم.

قال: إنه لعلم وما هو بذاك، ثم سكت ساعة ثم قال: إن عندنا علم ما كان وعلم ما هو كائن إلى أن تقوم الساعة.

قال: قلت: جعلت فداك هذا والله هو العلم.

قال: إنه لعلم وليس بذاك.

قلت: جعلت فداك فأي شيء العلم؟

قال: ما يحدث بالليل والنهار، الأمر من بعد الأمر، والشيء بعد الشيء، إلى يوم القيامة.

"Əshabımızdan olan bir dəstə şəxs Əhməd ibn Muhəmməddən, o, Abdullah ibn Həccaldan, o, Əhməd ibn Ömər əl-Hələbidən, o da Əbu Bəsirdən nəql edib dedi:

"Əbu Abdullahın (İmam Sadiqin) (əleyhissəlam) yanına daxil oldum. Ona dedim: "Sənə fəda olum, səndən bir məsələ barədə soruşmaq istəyirəm. Burada mənim sözümü eşidəcək bir adam varmı?"

Bu zaman Əbu Abdullah (əleyhissəlam) özü ilə digər otaq arasındakı pərdəni qaldırıb otağa baxdı və dedi: "Ey Əbu Muhəmməd, istədiyini soruş".

Mən dedim: “Sənə fəda olum, şiələrin belə nəql edir ki, Allah Rəsulu (sallallahu əleyhi və alihi və səlləm) Əliyə (əleyhissəlam) hər birindən min qapı açılan bir qapı öyrədib”.

Buyurdu: “Ey Əbu Muhəmməd! Allah Rəsulu (sallallahu əleyhi və alihi və səlləm) Əliyə (əleyhissəlam) hər birindən min qapı açılan min qapı öyrədib”.

Bu zaman mən dedim: “Allaha and olsun ki, bu, (əsl, kamil) elmdir!”

O, bir müddət (əli ilə və ya əlindəki çubuq ilə) fikirli şəkildə yeri eşdi, sonra dedi: “Bu da elmdir, (lakin əsl və kamil) elm bu deyil”.[9]

Sonra dedi: “Ey Əbu Muhəmməd! Bizim yanımızda “Camiə” vardır. Onlar[10] nə bilirlər ki, “Camiə” nədir?!”

Dedim: “Sənə fəda olum, “Camiə” nədir?”

Buyurdu: “Uzunluğu Allah Rəsulunun (sallallahu əleyhi və alihi və səlləm) dirsək ölçüsü[11] ilə yetmiş dirsək uzunluğunda olan bir səhifədir. O, Allah Rəsulunun (sallallahu əleyhi və alihi və səlləm) özü tərəfindən deyilmiş, Əlinin (əleyhissəlam) öz xətti ilə yazılmışdır. Orada bütün halal və haramlar vardır. Orada insanların ehtiyac duyduqları hər bir şey, hətta bədəni cızmağın diyəsi belə vardır.” Sonra əlini mənə vurub dedi: “Mənə icazə verirsənmi, ey Əbu Muhəmməd?”

Dedim: “Sənə fəda olum, mən sizinəm,[12] nə istəyirsiniz edin”.

Bu zaman əli ilə mənim (qolumu) sıxdı və sanki qəzəbli imiş kimi dedi: “Hətta bunun da diyəsi vardır!”.

Mən dedim: “Allaha and olsun ki, bu, elmdir!”

Buyurdu: “Bu, elmdir, lakin (əsl və kamil) elm bu deyil.”

Sonra bir qədər susdu və dedi: “Bizim yanımızda “Cəfr” vardır. Onlar nə bilirlər ki, “Cəfr” nədir?!”

Mən dedim: “Cəfr” nədir?”

Buyurdu: “Aşılanmış dəridən olan bir qabdır. Orada peyğəmbərlərin, vəsilərin və Bəni-İsraildən olan keçmiş alimlərin elmləri vardır”.

Mən dedim: “Elm məhz budur!”

Buyurdu: “Bu, elmdir, lakin (əsl, kamil) elm bu deyildir”.

---

[9] Əllamə Məclisi (Allah ona rəhmət etsin) bu cümlə barədə buyurmuşdur: “Yəni, bu elm də əhəmiyyətlidir və böyük bir elmdir. Lakin sənin düşündüyün ən böyük elm bu deyildir, yaxud: sənin İmamların elmləri arasında ən kamil və ən seçilən olduğunu düşündüyün elm bu elm deyildir.” (“Miratul-uqul”, c.3, səh.55). [Müt.]

[10] Müxaliflər və ya şiələrin böyük hissəsi. (Əllamə Məclisi). [Müt.]

[11] “Dirsək ölçüsü” (ərəbcə: “zira”) deyə ifadə etdiyimiz ölçü vahidi dirsək ilə əlin biləyi arasındakı məsafə həcmi qədərdir. [Müt.]

[12] Sizin ixtiyarınızdayam, sizin qulunuzam. [Müt.]

Bir qədər susandan sonra buyurdu: “Bizim yanımızda “Fatimənin (səlamullahi əleyha) müshəfi” vardır. Onlar nə bilirlər ki, “Fatimənin (səlamullahi əleyha) müshəfi” nədir?!”

Dedim: “Fatimənin (səlamullahi əleyha) müshəfi” nədir?”

Buyurdu: “O elə bir müshəfdir ki, orada sizin bu Quranınızın üç misli vardır.[13] Allaha and olsun ki, orada sizin Quranınızdan bircə hərf[14] də yoxdur”.

Mən dedim: “Allaha and olsun ki, bu, elmdir!”

Buyurdu: “Bu, elmdir, lakin (əsl, kamil) elm bu deyil”.

Sonra bir qədər susdu, ardınca buyurdu: “Bizim yanımızda keçmişdə baş vermiş və Qiyamət gününədək baş verəcək şeylərin elmi vardır”.

Mən dedim: “Sənə fəda olum, Allaha and olsun ki, elm məhz budur”.

Buyurdu: “Bu, elmdir, lakin (əsl, kamil) elm bu deyil”.

Dedim: “Sənə fəda olum, bəs elm nədir?”

Buyurdu: “Qiyamətədək gecə və gündüz hasil olan şeydir; bir-birinin ardınca baş verən işlər, şeylər(dir)[15]”.[16]

Əllamə Muhəmməd ibn Həsən Səffar səhih sənədlə belə nəql etmişdir:

حدثنا محمد بن الحسين، عن الحسن بن محبوب، عن محمد بن الفضل عن أبي حمزة الثمالي عن أبي جعفر عليه السلام قال: سمعته يقول فلمّا قضى محمد صلى الله عليه وآله نبوّته واستكملت أيّامه، أوحى الله إليه، يا محمد قد قضيت نبوّتك واستكملت أيّامك فاجعل العلم الذي عندك والأيمان والاسم الأكبر وميراث العلم وآثار النبوّة في أهل بيتك عند علي بن أبي طالب عليه السلام، فإني لم أقطع علم النبوّة من العقب من ذريّتك كما لم أقطعها من بيوتات الأنبياء.

“Bizə Muhəmməd ibn Hüseyn Həsən ibn Məhbubdan, o, Muhəmməd ibn Fəzldən, o da Əbu Həmzə əs-Sumalidən belə nəql edib: Əbu Cəfərin (İmam Baqirin) (əleyhissəlam) belə buyurduğunu eşitdim:

“Muhəmməd (sallallahu əleyhi və alihi və səlləm) peyğəmbərliyini başa vurub (sona çatdırıb) günlərini tamamladıqda Allah ona vəhy edib (dedi): “Ey Muhəmməd, peyğəmbərliyini başa vurub günlərini tamamlamısan.

---

13 Yəni, sizin görüb, oxuyub, başa düşdüyünüz Quranın həcmcə üç misli vardır. [Müt.]

14 Yəni, orada Qurandakı məna və hökmlərdən heç bir şey yoxdur. (Şeyx Mazandarani ) [Müt.]

15 Şeyx Mazandarani qeyd etmişdir: “Günbəgün, saatbasaat İmam üçün hasil olan elm Allah-taalanın ilhamı ilə, yaxud da mələyin danışması ilə baş verir.” (“Şərhu-usulil-Kafi”, c.5, səh.305.) Həmçinin, Əllamə Məclisi demişdir: “(Cümlənin mənası budur ki) həqiqi elm eşitməklə və ya kitablar oxuyub yadda saxlamaqla hasil olan elm deyil. Bu, təqliddir. Elm, məhz Allah-taala tərəfindən günbəgün, saatbasaat mömininin qəlbinə axıdılan şeydir. Mömin bu elmlə qəlbin aramlaşacağı, sinənin genişlənəcəyi və qəlbin nurlanacağı həqiqətləri kəşf edir.” (“Miratul-uqul”, c.3, səh.19.)

16 “Əl-Kafi”, c.1, səh.238-240. Bu hədisi Səffar da “Bəsairud-dərəcat” kitabında nəql etmişdir (səh.171-172).

Yanında olan elm, iman, "ismi-əkbər"[17], elm mirası və peyğəmbərlik əsərlərini Əhli-Beytin arasında, Əli ibn Əbu Talibin (əleyhissəlam) yanında qoy. Mən peyğəmbərlik elmini peyğəmbərlərin evlərindən kəsmədiyim (və aradan götürmədiyim) kimi sənin nəslindən də (aradan götürməmiş və) kəsməmişəm"."[18]

Digər pak İmamlar *(əleyhimussəlam)* da Əmirəlmömininin *(əleyhissəlam)* Allah Rəsulundan *(sallallahu əleyhi və alihi və səlləm)* irs apardığı elmləri Əmirəlmömininindən *(əleyhissəlam)* irs aparmışlar. Əllamə Səffarın "Bəsairud-dərəcat" kitabında, Şeyx Kuleyninin də "əl-Kafi" kitabında Muhəmməd ibn Müslimdən nəql etdikləri səhih hədisdə deyilir:

سمعت أبا جعفر عليه السلام يقول: «نزل جبرئيل على محمد صلى الله عليه وآله برمانتين من الجنة فلقيه علي عليه السلام فقال له: ما هاتان الرمانتان؟

قال: أمّا هذه فالنبوّة، ليس لك فيها نصيب، وأمّا هذه فالعلم، ثم فلقها رسول الله صلى الله عليه وآله فأعطاه نصفها وأخذ نصفها رسول الله صلى الله عليه وآله ثم قال: أنت شريكي فيه وأنا شريكك فيه، قال: فلم يعلم رسول الله صلى الله عليه وآله حرفاً إلاّ علّمه علياً عليه السلام ثم انتهى ذلك العلم إلينا» ثم وضع يده على صدره.

"Əbu Cəfərin (İmam Baqirin) (əleyhissəlam) belə dediyini eşitdim: "Cəbrail həzrət Muhəmmədə (sallallahu əleyhi və alihi və səlləm) Cənnətdən iki nar gətirdi. Əli (əleyhissəlam) onunla qarşılaşıb dedi: "Bu iki nar nədir?"

Peyğəmbər buyurdu: "Buna gəlincə, bu, peyğəmbərlikdir. Sənin bunda bir nəsibin yoxdur. Digərinə gəlincə isə, bu, elmdir".

Bundan sonra Allah Rəsulu (sallallahu əleyhi və alihi və səlləm) həmin ikinci narı böldü. Yarısını Əliyə verdi, digər yarısını isə özünə götürdü. Sonra dedi: "Sən elmdə mənim şərikim, mən də sənin şərikinəm".

Sonra Əbu Cəfər (əleyhissəlam) buyurdu: "Allah Rəsulu (sallallahu əleyhi və alihi və səlləm) bildiyi bütün hərfləri (elmləri) Əliyə (əleyhissəlam) öyrətdi. Sonra da həmin elm gəlib bizə çatdı." – Əbu Cəfər (əleyhissəlam) bunu deyib əlini sinəsinə qoydu".[19]

Muhəmməd ibn Həsən Səffar "Bəsairud-dərəcat" kitabında səhih sənədlə belə nəql etmişdir:

---

17 "İsmi-əkbər" (və ya: "Əl-ismul-əkbər"): ən böyük ad deməkdir. [Müt.]

18 "Bəsairud-dərəcat", səh.489. Bu hədisi Əllamə Kuleyni "Əl-Kafi" kitabında (c.1, səh.293) səhih sənədlə nəql etmişdir.

19 "Bəsairud-dərəcat", səh.289; "Əl-Kafi", c.1, səh.163.

حدثنا عبد الله بن عامر، عن عبد الله بن محمد الحجال، عن داود بن أبي يزيد الأحول عن أبي عبد الله قال: سمعته يقول: إنّا لو كنّا نفتي الناس برأينا وهوانا لكنّا من الهالكين، ولكنّها آثار من رسول الله صلى الله عليه وآله أصل علم نتوارثها كابر عن كابر، نكنزها كما يكنز الناس ذهبهم وفضّتهم.

"Bizə Abdullah ibn Amir, Abdullah ibn Muhəmməd Həccaldan, o da Davud ibn Əbu Yezid əl-Əhvəldən nəql edib dedi: "Əbu Abdullahın (əleyhissəlam) belə buyurduğunu eşitdim:

"Əgər biz camaata öz rəyimiz və kefimizdən fətva versəydik, həlak olanlardan olardıq. Lakin (bizim nəql etdiyimiz bu fətvalar və kəlamlar) Allah Rəsulundan (sallallahu əleyhi və alihi və səlləm) olan əsərlər və elm mənbəyidir.[20] Biz (bu elm mirasını) atadan-babadan irs aparırıq. Camaat öz qızıl və gümüşlərini qoruyub saxladıqları kimi biz də onları qoruyub saxlayırıq".[21]

Yenə Şeyx Səffar səhih sənədlə belə nəql etmişdir:

حدثنا أحمد بن محمد، عن الحسن بن محبوب، عن أبي حمزة الثمالي، عن جابر قال أبو جعفر: يا جابر والله لو كنّا نحدث الناس أو حدّثنا برأينا لكنّا من الهالكين، ولكنّا نحدثهم بآثار عندنا من رسول الله صلى الله عليه وآله يتوارثها كابرٌ عن كابر، نكنزها كما يكنز هؤلاء ذهبهم وفضتهم.

"Bizə Əhməd ibn Muhəmməd, Həsən ibn Məhbubdan, o, Əbu Həmzə əs-Sumalidən, o, Cabirdən, o da Əbu Cəfərdən (İmam Baqirdən) (əleyhissəlam) nəql edib dedi:

"Ey Cabir! Əgər biz camaatla öz rəyimiz əsasında danışsaydıq, həlak olanlardan olardıq. Lakin biz onlarla öz yanımızdakı Allah Rəsulundan (sallallahu əleyhi və alihi və səlləm) qalan (elm) əsərlər(i) əsasında danışırıq. Bu əsərləri (oğullar) atadan-babadan irs aparırlar. Bu camaat qızıl və gümüşlərini qoruyub saxladıqları kimi biz də onları qoruyub saxlayırıq".[22]

Şeyx Səffarın nəql etdiyi səhih hədisdə deyilir:

حدثنا يعقوب بن يزيد، عن محمد بن أبي عمير، عن عمر بن أذينة، عن الفضيل بن يسار، عن أبي جعفر عليه السلام قال: لو إنّا حدّثنا برأينا ضللنا كما ضلّ من كان قبلنا، ولكنّا حدّثنا ببينة من ربّنا بيّنها لنبيّه فبينها لنا.

[20] Ərəb dilində "asar" sözü hərfi mənada "əsərlər", "əlamətlər", "geriyə qalan şeylər" kimi tərcümə olunur. İşlənmə yerindən asılı olaraq müxtəlif mənalar daşıyır. Məhz bu yerdə "əsərlər" kəlməsini Peyğəmbərdən *(sallallahu əleyhi və alihi və səlləm)* geriyə qalan elm, elmin mirası kimi başa düşmək lazımdır. [Müt.]

[21] "Bəsairud-dərəcat", səh.319.

[22] "Bəsairud-dərəcat", səh.320.

“Bizə Yaqub ibn Yezid, Muhəmməd ibn Əbu Umeyrdən, o, Ömər ibn Üzeynədən, o, Fuzeyl ibn Yəsardan, o da Əbu Cəfərdən (İmam Baqirdən) (əleyhissəlam) nəql edib dedi:

“Əgər biz öz rəyimiz əsasında danışsaydıq, bizdən əvvəlkilər azdığı kimi biz də azardıq. Lakin biz Rəbbimiz tərəfindən olan dəlil-sübutlar əsasında danışırıq. Onu Rəbbimiz öz Peyğəmbərinə, Peyğəmbər də bizə bəyan etmişdir”.[23]

Siqətül-İslam Şeyx Kuleyninin nəql etdiyi səhih hədisdə deyilir:

علي، عن محمد بن عيسى، عن يونس، عن قتيبة قال: سأل رجل أبا عبد الله عليه السلام عن مسألة فأجابه فيها، فقال الرجل: أرأيت إن كان كذا وكذا ما يكون القول فيه؟ فقال له: مه ما أجيبك فيه من شيء فهو عن رسول الله صلى الله عليه وآله لسنا من أرأيت في شيء.

“Əli, Muhəmməd ibn İsadan, o, Yunisdən, o da Quteybədən nəql edib dedi:

“Bir nəfər Əbu Abdullaha (İmam Sadiqə) (əleyhissəlam) bir məsələ barədə sual verdi, o da ona cavab verdi. Bu zaman həmin şəxs dedi: “Əgər məsələ filan cür olsaydı, sənin nəzərində hökmü necə olardı?”

Əbu Abdullah (əleyhissəlam) ona dedi: “Dayan! Bu məsələdə sənə nə cavab verirəmsə, Allah Rəsulundandır (sallallahu əleyhi və alihi və səlləm). Bizim “sənin nəzərində” ilə bir işimiz olmaz![24]”[25]

Şeyx Səduq səhih sənədlə belə nəql etmişdir:

حدثنا محمد بن موسى بن المتوكل رحمه الله، قال: حدثنا عبد الله بن جعفر الحميري، عن أحمد بن محمد، عن الحسن بن محبوب، عن ابن سنان، عن جعفر بن محمد عن أبيه عليهما السلام قال: إنّ لله تعالى علماً خاصاً وعلماً عامّاً، فأمّا العلم الخاص فالعلم الذي لم يطلع عليه ملائكته المقربين وأنبيائه المرسلين، وأمّا علمه العام فإنّه علمه الذي أطلع عليه ملائكته المقربين وأنبياءه المرسلين، وقد وقع إلينا من رسول الله صلى الله عليه وآله.

“Bizə Muhəmməd ibn Musa ibn əl-Mütəvəkkil – Allah ona rəhmət etsin – nəql edib dedi: Abdullah ibn Cəfər Himyəri bizə Əhməd ibn Muhəmməddən, o, Həsən ibn Məhbubdan, o, İbn Sinandan, o, Cəfər ibn

---

[23] “Bəsairud-dərəcat”, səh.319.

[24] Yəni, biz “sənin nəzərində necədir” – sualı verilən şəxslərdən deyilik. Çünki bu sual, məhz qarşı tərəfin şəxsi rəyini öyrənmək üçün verilən bir sualdır. İmamlar *(əleyhimussəlam)* da şəxsi rəyləri əsasında söz demədikləri üçün onlara belə sual verilməz. Onların verdikləri bütün cavablar Allah Rəsulundandır *(sallallahu əleyhi və alihi və səlləm)*, Allah Rəsulunun *(sallallahu əleyhi və alihi və səlləm)* verdiyi cavablar da Allah tərəfindəndir. [Müt.]

[25] “Əl-Kafi”, c.1, səh.58.

Muhəmməddən (İmam Sadiqdən) (əleyhissəlam), o da atasından (əleyhissəlam) nəql edib dedi:

“Allah-taalanın bir xüsusi, bir də ümumi elmi vardır. Xüsusi elm Allahın Öz müqərrəb mələklərini və mürsəl peyğəmbərlərini xəbərdar etmədiyi, ümumi elm isə müqərrəb mələklərini və mürsəl peyğəmbərlərini xəbərdar etdiyi elmdir. Bu elm Allah Rəsulundan (sallallahu əleyhi və alihi və səlləm) bizə çatmışdır”.[26]

Siqətül-İslam Kuleyni “əl-Kafi” kitabında səhih sənədlə belə nəql etmişdir:

محمد، عن أحمد بن محمد، عن الحسين بن سعيد، عن فضالة، عن عمر بن أبان قال: سألت أبا عبد الله عليه السلام عمّا يتحدث الناس أنّه دفع إلى أم سلمة صحيفة مختومة فقال: إن رسول الله صلى الله عليه وآله لما قبض ورث علي عليه السلام علمه وسلاحه وما هناك ثم صار إلى الحسن ثم صار إلى الحسين عليهما السلام، قال: ثم صار إلى علي بن الحسين، ثم صار إلى ابنه ثم انتهى إليك فقال: نعم.

“Muhəmməd, Əhməd ibn Muhəmməddən, o, Hüseyn ibn Səiddən, o, Füzalədən, o da Ömər ibn Əbandan belə nəql etmişdir:

“Əba Əbdillah (əleyhis-səlam)-dan camaatın danışdığı bir şey barədə soruşdum. (Belə ki, camaat deyirdi ki,) Ümmü-Sələməyə möhürlənmiş bir səhifə verilibmiş.

Həzrət buyurdu: “Allah Rəsulu (sallallahu əleyhi və alihi və səlləm) dünyasını dəyişdikdən sonra Əli (əleyhissəlam) onun elmini, silahını və orada olanları[27] irs apardı. Sonra həmin miras Həsənə, sonra da Hüseynə çatdı”.

Soruşdum: “Sonra Əli ibn Hüseynə, sonra onun oğluna, sonra da sənə çatdı?”

Buyurdu: “Bəli”.[28]

Şeyx Kəşşi “Rical” kitabında İmam Rzanın *(əleyhissəlam)* Yunis ibn Əbdürrəhmana belə buyurduğunu nəql etmişdir:

...فلا تقبلوا علينا خلاف القرآن، فإنّا إن تحدّثنا حديثاً بموافقة القرآن وموافقة السنة إنّا عن الله وعن رسوله نتحدث، ولا نقول قال فلان وفلان فيتناقض كلامنا، إن كلام آخرنا مثل كلام أوّلنا وكلام أوّلنا مصادق لكلام آخرنا ...

---

26 “Ət-Təvhid”, səh.138.

27 Əllamə Məclisi “orada olanları” ifadəsinin izahı barədə demişdir: “Yəni, Peyğəmbərin *(sallallahu əleyhi və alihi və səlləm)* yanında olan keçmiş peyğəmbərlərin və vəsilərin mirasları və kitablarını.” (“Miratul-uqul”, c.3, səh.47).

28 “Əl-Kafi”, c.1, səh.235. Bu hədisi, həmçinin Əllamə Səffar “Bəsairud-dərəcat” kitabında, səh.206-da səhih sənədlə nəql etmişdir.

“...Qurana zidd olan şeyi bizim adımızdan qəbul etməyin. Biz bir hədis desək, mütləq Qurana və sünnəyə müvafiq deyərik. Şübhəsiz ki, biz (dediyimiz sözləri) Allahdan və Onun Rəsulundan (sallallahu əleyhi və alihi və səlləm) deyirik. Biz (başqaları kimi): "Filankəs belə dedi, filankəs elə dedi", - demirik. Buna görə də bizim sözlərimiz ziddiyyət təşkil etmir. (Xeyr!) Bizim sonuncumuzun sözü birincimizin sözü kimi, birincimizin sözü axırıncımızın sözü kimidir”.[29]

Əbul-Həsən Əli ibn Hüseyn ibn Babəveyh əl-Qumminin “əl-İmamə vət-təbsirətu minəl-hirə” kitabında nəql etdiyi səhih hədisdə deyilir:

وعنه – سعد ابن عبد الله الأشعري القمي – عن إبراهيم بن محمد الثقفي، عن عبد الرحمن بن أبي هاشم، قال: حدثنا سلام بن أبي عميرة الخراساني، عن أبان بن تغلب، عن أبي عبد الله عليه السلام، عن أبيه عليه السلام قال: قال رسول الله صلى الله عليه وآله: «من أراد أن يحيا حياتي ويموت ميتتي، ويدخل جنة عدن غرسها ربي فليتول عليّاً عليه السلام وليعادي عدوّه وليأتم بالأوصياء من بعده، أعطاهم الله علمي وفهمي وهم عترتي من لحمي ودمي، إلى الله أشكو من أمتي المنكرين لفضلهم القاطعين فيهم صلتي، وأيم الله ليقتلن ابني الحسين عليه السلام، لا أنالهم الله شفاعتي.»

“Səd ibn Abdullah əl-Əşəri əl-Qummi, İbrahim ibn Muhəmməd əs-Səqəfidən, o da Əbdür-Rəhman ibn Əbu Haşimdən nəql edib dedi: “Səlam ibn Əbu Ümeyrə əl-Xorasani bizə Əban ibn Təğlibdən, o, Əbu Abdullahdan (İmam Sadiqdən) (əleyhissəlam), o da atasından (əleyhissəlam) nəql edib dedi: Allah Rəsulu (sallallahu əleyhi və alihi və səlləm) buyurmuşdur:

“Kim mənim kimi yaşamaq, mənim kimi ölmək və Rəbbimin əkdiyi Ədn cənnətinə[30] daxil olmaq istəyirsə, Əlini (əleyhissəlam) dost tutmalı, onun düşməni ilə düşmən olmalı və ondan sonrakı vəsiləri imam qəbul etməlidir. Allah mənim elm və fəhmimi onlara vermişdir. Onlar mənim ətim və qanımdan olan itrətimdir. Onların fəzilətini inkar edən və onlarla əlaqədar qohumluq haqqıma riayət etməyən ümmətimdən Allaha şikayət edirəm. Allaha and olsun, oğlum Hüseyn (əleyhissəlam) qətlə yetiriləcək. Allah onlara (yəni, onu qətlə yetirənlərə) mənim şəfaətimi nəsib etməsin”.[31]

Əllamə Səffar səhih sənədlə belə nəql etmişdir:

---

[29] “Ricalul-Kəşşi” (“İxtiyaru-mərifətir-rical”), c.3, səh.490.

[30] “Cənnət” ərəb dilində “bağ” deməkdir, hədisin orijinalında da “...cənnətə adnin ğarasəhə Rabbi” ifadəsi işlədilmişdir. “Ğarasə” sözü ağac əkmək deməkdir. Deməli, hədisin hərfi tərcüməsi belə olur: “...Rəbbimin əkdiyi Ədn bağına daxil olmaq istəsə...”. “Rəbbimin əkdiyi” sözünə gəlincə isə, bu söz “Rəbbimin heç bir vasitə olmadan öz qüdrəti ilə əkdiyi” mənasındadır. Orijinallıq itməsin deyə, “əkmək” sözünü olduğu kimi saxladıq. [Müt.]

[31] “Əl-İmamə vət-təbsirə”, səh.172, №24; “Bəsairud-dərəcat”, səh.62-64; “əl-Kafi”, c.1, səh.209.

حدثنا عبد الله بن عامر، عن عبد الله بن محمد الحجال، عن داود بن أبي يزيد عن أحدهما قال: قال رسول الله صلى الله عليه وآله: من سرّه أن يحيا حياتي ويموت مماتي، ويدخل جنة ربي جنة عدن غرسها بيده، فليتول علي بن أبي طالب عليه السلام والأوصياء من بعده، فإنهم لحمي ودمي، أعطاهم الله فهمي وعلمي.

"Abdullah ibn Amir bizə Abdullah ibn Muhəmməd əl-Həccaldan, o, Davud ibn Əbu Yeziddən, o da onların ikisinin birindən (ya İmam Sadiq, ya da İmam Kazimdən (əleyhiməssəlam)) nəql edib dedi: Allah Rəsulu (sallallahu əleyhi və alihi və səlləm) buyurmuşdur:

"Kim mənim kimi yaşamaq, mənim kimi ölmək və Rəbbimin cənnətinə; onun öz əli ilə[32] əkdiyi Ədn cənnətinə daxil olmaq istəyirsə, Əli ibn Əbu Talibi və ondan sonrakı vəsiləri dost tutmalıdır. Onlar mənim ətim və qanımdırlar. Allah mənim elmimi və fəhmimi onlara vermişdir".[33]

Həmçinin, İmamlara *(əleyhimussəlam)* Allah Rəsulu *(sallallahu əleyhi və alihi və səlləm)* və Əmirəlmöminin Əli ibn Əbi Talibdən *(əleyhissəlam)* müxtəlif elmləri ehtiva edən bir sıra kitablar, səhifələr və qablar çatmışdır.

Siqətül-İslam Kuleyninin "əl-Kafi" kitabında səhih sənədlə nəql etdiyi hədisdə deyilir:

محمد بن يحيى، عن أحمد بن محمد، عن ابن محبوب، عن ابن رئاب، عن أبي عبيدة قال: سأل أبا عبد الله بعض أصحابنا عن الجفر فقال: هو جلد ثور مملوء علماً، فقال له: فالجامعة؟ قال: تلك صحيفة طولها سبعون ذراعاً في عرض الأديم مثل فخذ الفالج فيها كل ما يحتاج الناس إليه، وليس من قضية إلاّ وهي فيها حتى أرش الخدش.

قال: فمصحف فاطمة؟ فسكت طويلاً ثم قال: إنّكم لتبحثون عمّا تريدون وعمّا لا تريدون، إنّ فاطمة مكثت بعد رسول الله صلى الله عليه وآله خمسة وسبعين يوماً، وكان دخلها حزن شديد على أبيها وكان جبرائيل يأتيها فيحسن عزاءها على أبيها ويطيب نفسها ويخبرها عن أبيها ومكانه، ويخبرها بما يكون بعدها في ذريتها، وكان علي يكتب ذلك فهذا مصحف فاطمة.

---

[32] Şübhəsiz ki, buradakı "əl" sözü məcazi mənada işlənmişdir. Şeyx Muhəmməd Saleh Mazandarani demişdir:

وقوله «بيده» معناه بقدرته أو لنعمته على أن يكون الباء بمعنى اللام لأن الجارحة محال على الله سبحانه ولا يرد أن حملها على القدرة بعيد لأن كل شيء بقدرته لأن المراد التأكيد والبيان أو التخصيص للتنبيه على أنها ليست كجنات الدنيا المخلوقة عن وسائط من غرس وغيره وإنما إنشاؤها بقول «كن» وأضافها إلى نفسها تشريفا.

"**Öz əli ilə**" ifadəsinə gəlincə, bu sözün mənası "qüdrəti ilə", və ya – "bi" ön qoşmasının "li" önqoşması mənasında işləndiyini düşünsək – "nemətinə görə" şəklindədir. Çünki, Sübhan olan Allahın bədən üzvlərinə malik olması mümkünsüzdür. Kimsə, "Əl kəlməsinin qüdrət mənasına aid edilməsi uzaq nəzərdir, çünki onsuz da hər bir şey Onun qüdrətindədir", - deyərək etiraz edə bilməz. Buna belə cavab verilər ki, *(əl sözünün qüdrət mənasında işlədilməsi)* təkid və izah üçündür, yaxud da Ədn cənnətinin *(Ədn bağının)* dünya bağları kimi olmadığına diqqət çəkmək üçündür. Həmin bağ *(dünya bağları kimi)* əkinçi və s. vasitələrlə deyil, məhz "ol!" – sözü ilə yaranmışdır. Allahın bu bağı özünə nisbət verməsi isə bağın şərafətini artırmaq üçündür." ("Şərhu-usulil-kafi", c.5, səh.266)

[33] "Bəsairud-dərəcat", səh.71.

“Muhəmməd ibn Yəhya, Əhməd ibn Məhbubdan, o, İbn Məhbubdan, o, İbn Riabdan, o da Əbu Ubeydədən belə nəql etmişdir:

“Əshabımızdan bir nəfər Əbu Abdullahdan (İmam Sadiqdən) (əleyhissəlam) “Cəfr” barədə soruşdu. Əbu Abdullah (əleyhissəlam) buyurdu: “O, elmlə dolu olan bir öküz dərisidir”.

Həmin şəxs dedi: “Bəs “Camiə” nədir?”

Buyurdu: “O, yetmiş zira uzunluğunda olan aşılanmış dəridən olan bir səhifədir. O(nun eni) iki hörgüclü böyük dəvənin budu qədərdir. Onda insanların ehtiyac duyduqları bütün şeylər vardır. Elə bir məsələ yoxdur ki, orada olmasın, hətta bədəni cızmağın diyəsi də orada vardır”.

Həmin şəxs dedi: “Bəs “Fatimənin (səlamullahi əleyha) müshəfi” nədir?”

Bu zaman o, uzun müddət sükut etdi. Sonra buyurdu: “Siz istədiyinizi də axtarırsınız, istəmədiyinizi də.[34] Həqiqətən, Fatimə (səlamullahi əleyha) Allah Rəsulundan (sallallahu əleyhi və alihi və səlləm) sonra 75 gün yaşadı. Atasına görə çox qəmgin idi. Cəbrail (əleyhissəlam) onun yanına gəlib atasına görə başsağlığı verir, ona təskinlik verərək atası və onun məkanı barədə, həmçinin Fatimədən (səlamullahi əleyha) sonra övladlarının başına gələcək şeylər barədə xəbər verirdi. Həmin vaxt Əli (əleyhissəlam) də bunları yazırdı. Fatimənin (səlamullahi əleyha) müshəfi budur”.[35]

Əllamə Səffar səhih sənədlə belə nəql etmişdir:

حدثنا محمد بن عبد الحميد، عن يونس بن يعقوب، عن منصور بن حازم عن أبي عبد الله عليه السلام قال: قلت إنّ الناس يذكرون أن عندكم صحيفة طولها سبعون ذراعاً فيها ما يحتاج إليه الناس، وأن هذا هو العلم، فقال أبو عبد الله عليه السلام: ليس هذا هو العلم إنما هو أثر عن رسول الله صلى الله عليه وآله إن العلم الذي يحدث في كل يوم وليلة.

“Bizə Muhəmməd ibn Əbdül-Həmid Yunis ibn Yaqubdan, o, Mənsur ibn Hazimdən belə nəql etdi:

“Əbu Abdullaha (İmam Sadiqə) (əleyhis-səlam) dedim: “Camaat deyir ki, sizin yanınızda uzunluğu yetmiş zira olan bir səhifə vardır. Həmin səhifədə camaatın ehtiyac duyduğu hər şey var və elm də məhz budur”.

---

34 Bilməyiniz vacib olan şeyi də soruşursunuz, vacib olmayan şeyi də. [Müt.]

35 “Əl-Kafi”, c.1, səh.241; “Bəsairud-dərəcat”, səh.174. Bu hədis həzrət Fatimənin *(səlamullahi əleyha)* müshəfinin həqiqətini açıqlayır. Onun bəzi şiə düşməni olan nadan iftiraçıların iddia etdikləri kimi “Şiələrin Quranı” olmadığını göstərir.

Əbu Abdullah (əleyhissəlam) buyurdu: “Elm bu deyil. Bu, məhz Allah Rəsulundan (sallallahu əleyhi və alihi və səlləm) olan bir mirasdır. Elm hər gün və gecə hasil olan şeydir”.[36]

Əllamə Səffar səhih sənədlə belə nəql etmişdir:

حدثنا أحمد بن محمد، عن الحسين بن سعيد، عن فضالة بن أيوب، عن القاسم، عن بريد بن معاوية العجلي، عن محمد بن مسلم قال: قال أبو جعفر عليه السلام: إن عندنا صحيفة من كتب علي طولها سبعون ذراعاً فنحن نتبع ما فيها لا نعدوها، وسألته عن ميراث العلم ما بلغ أجوامع هو من العلم أم فيه تفسير كل شيء من هذه الأمور التي تتكلم فيه الناس مثل الطلاق والفرائض، فقال: إن علياً كتب العلم كله القضاء والفرائض، فلو ظهر أمرنا لم يكن شيء إلاّ فيه نمضيها.

Əhməd ibn Muhəmməd bizə Hüseyn ibn Səiddən, o, Füzalə ibn Əyyubdan, o, Qasimdən, o, Büreyd ibn Müaviyə əl-İclidən, o da Muhəmməd ibn Müslimdən nəql edib dedi: “Əbu Cəfər (İmam Baqir) (əleyhissəlam) buyurdu:

“Həqiqətən, bizim yanımızda Əlinin (əleyhissəlam) xətti ilə (yazılmış) olan[37] bir səhifə vardır ki, uzunluğu yetmiş ziradır. Biz orada yazılanlara əməl edir və ondan kənara çıxmırıq”.

Bu zaman mən Əbu Cəfərdən (onlara) gəlib çatan elm mirası barədə soruşdum. Bu mirasın elmi toplulardan ibarət olduğunu, yoxsa orada talaq, vacibatlar və s. kimi camaatın danışdığı işlərin hər birinin (ayrı-ayrı) təfsirinin olduğu soruşdum.[38]

Buyurdu: “Həqiqətən, Əli bütün elmi: (bütün) qəzavət və vacibatları yazmışdır. Əgər bizim işimiz aşkara çıxsaydı, orada olan hər bir şeyi(n hökmünü) həyata keçirərdik”.[39]

Əllamə Səffar səhih sənədlə belə nəql etmişdir:

حدثنا يعقوب بن يزيد، عن الحسن بن علي، عن عبد الله بن سنان، عن أبي عبد الله عليه السلام قال: «والله إنّ عندنا لجلد ماعز وضأن إملاء رسول الله صلى الله عليه وآله وخط علي عليه السلام، وإنّ عندنا لصحيفة طولها

---

36 “Bəsairud-dərəcat”, səh.159.

37 Və ya: “Əlinin kitablarından olan”. [Müt.]

38 Zahirən cümlənin mənası bundan ibarətdir ki, ravi miras olaraq gəlib çatan bu yetmiş zira uzunluğundakı səhifədə mövcud olan elmin hansı üslubda yazıldığını soruşmuşdur. Yəni görəsən orada fiqhi və ya əqidəvi məsələlər tək-tək müzakirə olunmuşdur, yoxsa hər bir məsələ üçün ümumi qayda-qanunlar təyin edilmişdir və İmam da o ümumi qaydaları ayrı-ayrı məslələrə tətbiq edir? [Müt.]

39 “Bəsairud-dərəcat”, səh.163.

سبعون ذراعاً وأملاها رسول الله صلى الله عليه وآله وخطها علي عليه السلام بيده، وإنّ فيها لجميع ما يحتاج إليه حتى أرش الخدش.»

“Yaqub ibn Yezid bizə Həsən ibn Əlidən, o, Abdullah ibn Sinandan, o da Əbu Abdullahdan (əleyhissəlam) nəql edərək dedi:

“Allaha and olsun ki, bizim yanımızda keçi və qoyun dərisi vardır ki, (üzərlərində) Allah Rəsulunun (sallallahu əleyhi və alihi və səlləm) diktəsi və Əlinin (əleyhissəlam) xətti (ilə yazılmış elm) vardır. Bizim yanımızda uzunluğu yetmiş zira həddində olan bir səhifə vardır ki, (o səhifədəki elmi) Allah Rəsulu (sallallahu əleyhi və alihi və səlləm) özü imla etmiş, Əli də (əleyhissəlam) öz əli ilə yazmışdır. Həqiqətən, orada ehtiyac duyulan hər şey, hətta bədəni cızmağın diyəsi belə vardır”.[40]

Əllamə Səffar səhih sənədlə belə nəql etmişdir:

حدثنا يعقوب بن يزيد، عن الحسن بن علي الوشاء، عن عبد الله بن سنان عن أبي عبد الله عليه السلام قال: سمعته يقول: «إنّ عندنا صحيفة طولها سبعون ذراعاً إملاء رسول الله صلى الله عليه وآله وخطّه علي بيده، وإن فيها لجميع ما يحتاج إليه الناس حتى أرش الخدش.»

“Yaqub ibn Yezid bizə Həsən ibn Əli ibn əl-Vəşşadan, o da Abdullah ibn Sinandan belə nəql etmişdir: Əbu Abdullahın (İmam Sadiqin) (əleyhissəlam) belə buyurduğunu eşitdim:

“Həqiqətən, bizim yanımızda uzunluğu yetmiş zira olan bir səhifə vardır ki, (oradakı elmi) Allah Rəsulu (sallallahu əleyhi və alihi və səlləm) diktə etmiş, Əli (əleyhissəlam) də öz əl xətti ilə yazmışdır. Orada insanların ehtiyac duyduqları hər bir şey, hətta bədəni cızmağın diyəsi belə vardır”.[41]

İbn Babəveyh səhih sənədlə belə nəql etmişdir:

وعنه– سعد بن عبد الله – عن علي بن إسماعيل بن عيسى وأيوب بن نوح، عن صفوان بن يحيى، عن العيص بن القاسم عن المعلى بن خنيس قال: قال أبو عبد الله عليه السلام: «ما من نبي ولا وصي، ولا ملك، إلاّ وهو في كتاب عندي، لا والله ما لمحمد بن عبد الله بن الحسن فيه اسم.»

“Səd ibn Abdullah, Əli ibn İsmayıl ibn İsadan və Əyyub Nuhdan, onlar Səfvan ibn Yəhyadan, o, Ays ibn Qasimdən, o da Müəlla ibn Xüneysdən belə nəql etmişdir: Əbu Abdullah (İmam Sadiq) (əleyhissəlam) buyurdu:

40 “Bəsairud-dərəcat”, səh.155.
41 “Bəsairud-dərəcat”, səh. 163.

"Elə bir peyğəmbər, vəsi (canişin) və hökmdar yoxdur ki, onun adı mənim yanımdakı kitabda olmasın. Xeyr, Allaha and olsun ki, həmin kitabda Muhəmməd ibn Abdullah ibn Həsənin[42] adı yoxdur".[43]

Həmçinin, səhih sənədlə belə nəql etmişdir:

وعنه – سعد بن عبد الله – عن أحمد بن محمد، عن الحسين بن سعيد، عن محمد بن أبي عمير، عن عمر ابن أذينة، عن الفضيل بن يسار وبريد بن معاوية وزرارة: إن عبد الملك ابن أعين قال لأبي عبد الله عليه السلام: إن الزيدية والمعتزلة قد أطافت لمحمد بن عبد الله بن الحسن، فهل له سلطان؟ فقال: «والله، إن عندي لكتاباً فيه تسمية كل نبي، وكل ملك يملك، ولا والله، ما محمد بن عبد الله في واحد منهما»

"Səd ibn Abdullah, Əhməd ibn Muhəmməddən, o, Hüseyn ibn Səiddən, o, Muhəmməd ibn Əbu Ümeyrdən, o, Ömər ibn Üzeynədən, o da Füzeyl ibn Yəsar, Büreyd ibn Müaviyə və Zürarədən nəql etmişdir ki, Əbdül-Məlik ibn Əyən Əbu Abdullaha (İmam Sadiqə) (əleyhissəlam) dedi:

"Zeydilər və mötəzililər Muhəmməd ibn Abdullah ibn Həsənin ətrafına toplaşıblar. Görəsən o, hakimiyyətə gələ biləcəkmi?"

Əbu Abdullah (İmam Sadiq) (əleyhissəlam) dedi: "Allaha and olsun ki, mənim yanımda iki kitab vardır ki, orada bütün peyğəmbərlərin və hakimiyyətə gələcək hökmdarların adları vardır. Xeyr, Allaha and olsun ki, Muhəmməd ibn Abdullah(ın adı) onların heç birində yoxdur".[44]

Əllamə Səffar səhih sənədlə belə nəql etmişdir:

حدثنا محمد بن الحسين، عن صفوان، عن أبي الصباح قال: قلت لأبي عبد الله عليه السلام: بلغنا أنّ رسول الله صلى الله عليه وآله قال لعلي عليه السلام: أنت أخي وصاحبي وصفيّي ووصيّي وخالصي من أهل بيتي وخليفتي في أمّتي، وسأنبئك فيما يكون فيها من بعدي، يا علي إني أحببت لك ما أحبّه لنفسي وأكره لك ما أكرهه لها.

فقال لي أبو عبد الله عليه السلام: «هذا مكتوب عندي في كتاب علي، ولكن دفعته أمس حين كان هذا الخوف وهو حين صلب المغيرة.»

"Muhəmməd ibn Hüseyn bizə Səfvandan, o da Əbüs-Səbbahdan belə nəql etdi:

"Əbu Abdullaha (İmam Sadiqə) (əleyhissəlam) dedim: "Bizə belə çatıb ki, Allah Rəsulu (sallallahu əleyhi və alihi və səlləm) Əliyə (əleyhissəlam) demişdir: "Sən mənim

---

[42] O, Muhəmməd ibn Abdullah ibn Həsən ibn Həsən ibn Əli ibn Əbu Talibdir. Zeydiyyə imamlarından biri olmuşdur. Ləqəbi isə "Nəfsi-zəkiyyə"dir.

[43] "Əl-İmamətu vət-təbsirə", səh.51; "Bəsairud-dərəcat", səh.189, səhih sənədlə.

[44] "Əl-İmamətu vət-təbsirə", səh.51; "əl-Kafi", c.1, səh.242, səhih sənədlə.

qardaşım, yoldaşım, seçdiyim şəxs, vəsim, Əhli-Beytimdən olan xüsusi şəxsim və ümmətim arasında xəlifəmsən. Sənə özümdən sonra ümmətimin başına gələcək hadisələri xəbər verəcəyəm. Ey Əli, mən özüm üçün istədiyim (və sevdiyim) şeyi sənin üçün də istəmişəm, özüm üçün istəmədiyim (və sevmədiyim) şeyi, sənin üçün də istəmərəm".

Əbu Abdullah (İmam Sadiq) (əleyhissəlam) mənə dedi: "Bu, yanımda olan Əlinin kitabında yazılmışdır. Lakin, dünən bu qorxu baş verdiyi zaman – Müğeyrə çarmıxa çəkildiyi zaman[45] – mən onu (başqa birisinə) verdim (başqa bir nüsxədə: dünən onu torpağa basdırdım)".[46]

Siqətül-İslam Kuleyni səhih sənədlə belə nəql etmişdir:

عدة من أصحابنا عن أحمد بن محمد بن عيسى، عن علي بن الحكم، عن معاوية بن وهب، عن سعيد السمان قال: كنت عند أبي عبد الله عليه السلام إذ دخل عليه رجلان من الزيدية فقالا له: أفيكم إمام مفترض الطاعة؟ قال: فقال: «لا»، قال: فقالا له: قد أخبرنا عنك الثقات أنك تفتي وتقر وتقول به ونسميهم لك، فلان وفلان، وهم أصحاب ورع وتشمير وهم ممن لا يكذب فغضب أبو عبد الله عليه السلام فقال: «ما أمرتهم بهذا» فلما رأيا الغضب في وجهه خرجا.

فقال لي: «أتعرف هذين؟»

قلت: نعم هما من أهل سوقنا وهما من الزيدية وهما يزعمان أن سيف رسول الله صلى الله عليه وآله عند عبد الله بن الحسن.

فقال: «كذبا لعنهما الله، والله ما رآه عبد الله بن الحسن بعينيه ولا بواحدة من عينيه ولا رآه أبوه، اللهم إلاّ أن يكون رآه عند علي بن الحسين، فإن كانا صادقين فما علامة في مقبضة؟ وما أثر في موضع مضربه؟.!

وإن عندي لسيف رسول الله صلى الله عليه وآله وإن عندي لراية رسول الله صلى الله عليه وآله ودرعه ولامته ومغفره، فإن كانا صادقين فما علامة في درع رسول الله صلى الله عليه وآله؟ وإن عندي لراية رسول الله صلى الله عليه وآله المغلبة، وإن عندي ألواح موسى وعصاه، وإن عندي لخاتم سليمان بن داود، وإن عندي الطست الذي كان موسى يقرب به القربان، وإن عندي الاسم الذي كان رسول الله صلى الله عليه وآله إذا وضعه بين المسلمين والمشركين لم يصل من المشركين إلى المسلمين نشابة، وإن عندي لمثل الذي جاءت به الملائكة.

ومثل السلاح فينا كمثل التابوت في بني إسرائيل، في أي أهل بيت وجد التابوت على أبوابهم أوتوا النبوة ومن صار إليه السلاح منا أوتي الإمامة، ولقد لبس أبي درع رسول الله صلى الله عليه وآله فخطت على الأرض خطيطاً ولبستها أنا فكانت وكانت وقائمنا من إذا لبسها ملاها إن شاء الله.

---

[45] Müğeyrə: Müğeyrə ibn Səiddir. "*Müğeyrə çarmıxa çəkildiyi zaman*" – ifadəsi İmamın *(əleyhissəlam)* sözü də ola bilər, hədisi nəql edən şəxsin sözü də. [Müt.]

[46] "Bəsairud-dərəcat", səh.168.

“Əshabımızdan olan bir dəstə şəxs Əhməd ibn Muhəmməd ibn İsadan, o, Əli ibn Həkəmdən, o, Müaviyə ibn Vəhəbdən, o da Səid əs-Səmmandan belə nəql etmişdir:

“Əbu Abdullahın (İmam Sadiqin) (əleyhissəlam) yanında idim. Bu zaman zeydilərdən olan iki nəfər onun yanına daxil olub dedilər: “Sizin aranızda itaəti vacib olan imam vardırmı?”

Əbu Abdullah buyurdu: “Xeyr”.[47]

Onlar dedilər: “Güvənilən şəxslər bizə sənin barəndə belə xəbər veriblər ki, sən bu işə[48] fətva verir, onu təsdiq edir və ona etiqad edirsən. Biz o şəxslərin adlarını sənin üçün sadalaya bilərik. Onlar filankəs, filankəs... və filankəsdir. Onlar vərə (böyük iman) və təqva sahibləridirlər. Onlar yalan danışmayan şəxslərdəndirlər”.

Bu zaman Əbu Abdullah (əleyhissəlam) qəzəbləndi və dedi: “Mən onlara bunu əmr etməmişəm”.

Həmin iki nəfər Əbu Abdullahın (əleyhissəlam) üzündə qəzəb gördükdə çıxıb getdilər.

(Onlar çıxıb gedəndən sonra) Əbu Abdullah mənə dedi: “Bu iki nəfəri tanıyırsan?”

Mən dedim: “Bəli. Onlar bizim bazarın əhlindən və zeydi məzhəbindəndirlər. Onlar iddia edirlər ki, Allah Rəsulunun (sallallahu əleyhi və alihi və səlləm) qılıncı Abdullah ibn Həsənin yanındadır”.

Buyurdu: “Yalan deyiblər, Allah onlara lənət etsin! Allaha and olsun ki, Abdullah ibn Həsən o qılıncı nə iki gözü ilə, nə də bir gözü ilə görüb[49].

---

[47] İmamın *(əleyhissəlam)* belə cavab verməsi iki cür izah edilə bilər. Birincisi: İmam *(əleyhissəlam)* bu sözü tövriyə məqsədi ilə demişdir. Belə ki, “xeyr” deməklə əslində “sizin etiqadınız əsasında (*sizin etiqadınıza uyğun olaraq)* bizim aramızda itaəti vacib olan imam yoxdur” – demək istəmişdir. Çünki zeydiyyə firqəsinin etiqadına görə imam, yalnız qılıncla qiyam edən şəxs ola bilərdi. Buna görə də İmam *(əleyhissəlam)* onların “sizin aranızda itaəti vacib olan imam vardırmı?” – sualına “yox”, - deyə cavab verir. Çünki, İmam Sadiq *(əleyhissəlam)* qılıncla qiyam etməmişdi, buna görə də qarşı tərəfin nəzərində itaəti vacib olan imam sayılmırdı. Hədisi başqa yöndən təhlil etdiyimiz zaman bu məsələni daha aydın şəkildə başa düşə bilərik. Fərz edək ki, İmam Sadiq *(əleyhissəlam)* həmin iki zeydi şəxsin sualına “bəli” cavabı verir. Görəsən, bu yerdə qarşı tərəfin sualı və ya iradı necə olardı? Şübhəsiz ki, onlar: “əgər itaəti vacib olan imam sizin aranızdadırsa, bəs nəyə görə qılıncla qiyam etmir?”, – deyə irad tutacaqdılar. Buna görə də İmam *(əleyhissəlam)* sonradan tutulacaq iradı əvvəlcədən bilərək suala qarşı tərəfin mövqeyindən cavab vermiş, bu yolla tövriyə edərək sualın həqiqi cavabından yayınmışdır. İmamın *(əleyhissəlam)* sualın həqiqi cavabından yayınmasının səbəbinə gəlincə, bunu həmin dövrün olduqca gərgin və təhlükəli ictimai-siyasi durumunda axtarmaq lazımdır.
İkinci ehtimal budur ki, İmam *(əleyhissəlam)* bu sözü təqiyyə ilə demişdir. [Müt.]

[48] Yəni: “özünün imam olmağına”. Yaxud: “itaəti vacib olan imamın sizin ailənizdə olmasına” *(çünki, Abdullah ibn Həsən ibn Abdullah İmam Həsənin (əleyhissəlam) nəslindən idi. Məlumdur ki, imamət İmam Həsənin (əleyhissəlam) deyil, İmam Hüseynin (əleyhissəlam) nəslindəndir)*. [Müt.]

[49] Azərbaycan dilində bu cümləni "heç gözünün ucu ilə də görməyib" kimi başa düşə bilərik. [Red.]

Onun atası da o qılıncı görməyib. Görsə də, yalnız Əli ibn Hüseynin (əleyhissəlam) yanında görmüş ola bilər. (Başqa heç vaxt!) Əgər düz deyirlərsə, (o zaman Abdullah ibn Həsəndən xəbər alsınlar görək) qılıncın tutacağındakı əlamət nədir? Qılıncın vuran yerindəki iz (nişanə) nədir?

Allah Rəsulunun (sallallahu əleyhi və alihi və səlləm) qılıncı mənim yanımdadır. Allah Rəsulunun (sallallahu əleyhi və alihi və səlləm) bayrağı, zirehi, silah-sursatı və dəbilqəsi mənim yanımdadır. Əgər doğru deyirlərsə, (desinlər görək) Allah Rəsulunun (sallallahu əleyhi və alihi və səlləm) zirehində nə əlamət var? Allah Rəsulunun (sallallahu əleyhi və alihi və səlləm) qələbə gətirən bayrağı mənim yanımdadır. Musanın (əleyhissəlam) lövhələri və əsası mənim yanımdadır. Süleyman ibn Davudun (əleyhissəlam) üzüyü mənim yanımdadır. Musanın (əleyhissəlam) qurbanlıq təqdim etdiyi teşt mənim yanımdadır. Müsəlmanlarla müşriklər qarşılaşdığı zaman Allah Rəsulunun (sallallahu əleyhi və alihi və səlləm) oxuduğu və nəticədə müşriklər tərəfindən müsəlmanlara tərəf bircə oxun da gəlmədiyi ad mənim yanımdadır. Mələklərin gətirdiyi şeyin bənzəri də mənim yanımdadır.[50]

Bizim aramızda silahın məsəli Bəni-İsrail arasında tabutun məsəli kimidir. Tabut hansı ev əhlinin qapısının ağzında olardısa, həmin ailəyə peyğəmbərlik verilərdi. Bizim aramızda da, silah kimə çatsa, həmin şəxsə imamət verilər. Atam Allah Rəsulunun (sallallahu əleyhi və alihi və səlləm) zirehini geyindi, lakin zireh yerə çatdı.[51] Mən də onu geyindim, atamın geyindiyi kimi oldu. Bizim Qaimimiz (əleyhissəlam) onu geyindikdə isə zireh tam əyninə olacaq, inşallah".[52]

Siqətül-İslam Kuleyni səhih sənədlə belə nəql etmişdir:

عدة من أصحابنا، عن سهل بن زياد، ومحمد بن يحيى، عن أحمد بن محمد، وعلي ابن إبراهيم، عن أبيه، وحميد بن زياد، عن الحسن بن محمد، كلهم عن علي ابن رئاب، عن أبي بصير قال: سألت أبا عبد الله عليه السلام عن شيء من الفرائض فقال لي: «ألا أخرج لك كتاب علي عليه السلام؟» فقلت: كتاب علي لم يدرس؟ فقال: يا أبا محمد إنّ كتاب علي لم يدرس، فأخرجه فإذا هو كتاب جليل...

---

[50] "Mələklərin gətirdiyi şey" dedikdə, mələklərin Bəni-İsrail arasına gətirdikləri tabut nəzərdə tutulur. "Onun bənzəri olan şey" dedikdə isə Allah Rəsulunun *(sallallahu əleyhi və alihi və səlləm)* silahı nəzərdə tutulur. Bu iki şey arasında nə kimi bənzərliyin olduğu isə hədisin ardında açıqlanmışdır. [Müt.]

[51] Yəni, əyninə uzun oldu. "Yerə çatdı" – ifadəsi uzunluğu ifadə etmək üçün işlədilən məcazi mənalı sözdür. Əllamə Məclisi demişdir ki, "bəlkə də bu zireh, əyinə tam uyğun gəlməsi imamətin əlamətlərindən sayılan zirehdən fərqli bir zirehdir." ("Miratul-uqul", c.3, səh.43). Həmçinin, bu zirehlə bağlı Muhəmməd Saleh Mazandaraninin və Əllamə Məclisinin digər fərqli nəzərləri də vardır ki, söz uzanmasın deyə onları qeyd etmirik. Maraqlananlar "Miratul-uqul", c.3, səh.43-44-ə və "Şərhu-usulil-Kafi", c.5, səh.325-ə müraciət edə bilərlər. [Müt.]

[52] "Əl-Kafi", c.1, səh.232-233.

Əshabımızdan bir dəstə şəxs Səhl ibn Ziyad və Muhəmməd ibn Yəhyadan, onlar da Əhməd ibn Muhəmməddən, həmçinin Əli ibn İbrahim atası və Humeyd ibn Ziyaddan, onlar da Həsən ibn Muhəmməddən, Əhməd ibn Muhəmməd və Həsən ibn Muhəmməd isə Əli ibn Riabdan, o da Əbu Bəsirdən belə nəql etmişdir:

"Əbu Abdullahdan (İmam Sadiqdən) (əleyhissəlam) vaciblərdən biri barədə soruşdum. Mənə dedi: "Sənin üçün Əlinin (əleyhissəlam) kitabını çıxartmayımmı? (Onu sənə göstərməyimmi?)"

Dedim: "Məgər Əlinin (əleyhissəlam) kitabı xarab olub aradan getməyib?"

Dedi: "Ey Əbu Muhəmməd, Əlinin kitabı xarab olub aradan gedib?!" Sonra həmin kitabı gətirdi. Onun əzəmətli bir kitab olduğunu gördüm..."[53]

Siqətül-İslam Kuleyni "əl-Kafi" kitabında səhih sənədlə belə nəql etmişdir:

علي بن إبراهيم، عن أبيه، عن ابن أبي عمير، ومحمد بن عيسى، عن يونس بن عبد الرحمن، جميعاً عن صفوان، أو قال عن عمر بن أذينة، عن محمد بن مسلم قال: أقرأني أبو جعفر عليه السلام صحيفة كتاب الفرائض التي هي من إملاء رسول الله صلى الله عليه وآله وخط علي عليه السلام بيده...

"Əli ibn İbrahim atasından, o, İbn Əbu Umeyr və Muhəmməd ibn İsadan, onlar Yunis ibn Əbdür-Rəhmandan, o, Səfvandan – yaxud, dedi ki: – Ömər ibn Üzeynədən, o da Muhəmməd ibn Müslimdən belə nəql etmişdir:

"Əbu Cəfər (İmam Baqir) (əleyhissəlam) Allah Rəsulunun (sallallahu əleyhi və alihi və səlləm) diktəsi və Əlinin (əleyhissəlam) əl xətti ilə yazılmış, (içində) vaciblərin (yazıldığı) kitabı olan səhifəni[54] mənə oxutdurdu..."[55]

Siqətül-İslam Kuleyni səhih sənədlə belə nəql etmişdir:

محمد بن يحيى، عن محمد بن عبد الجبار، عن محمد بن إسماعيل، عن علي بن النعمان، عن ابن مسكان، عن أبي بصير عن أبي عبد الله عليه السلام قال: قال لي: يا أبا محمد إنّ الله عزّ وجل لم يعط الأنبياء شيئاً إلاّ وقد أعطاه محمداً صلى الله عليه وآله، قال: وقد أعطى محمداً جميع ما أعطى الأنبياء، ومنها الصحف التي قال الله عزّ وجل {صُحُفِ إِبْرَاهِيمَ وَمُوسَى} قلت: جعلت فداك هي الألواح؟ قال: نعم.

[53] "Əl-Kafi", c.7, səh.119.

[54] Qeyd edək ki, "səhifə" sözü "vərəq" anlamına gəlsə də, ümumiyyətlə üzərinə yazı yazılan bütün əşyalara aid edilə bilər. Dini mətnlərdə "səhifə" deyərkən, adətən "kitab" nəzərdə tutulur. [Müt.]

[55] "Əl-Kafi", c.7, səh.93.

“Muhəmməd ibn Yəhya, Muhəmməd ibn Əbdül-Cabbardan, o, Muhəmməd ibn İsmayıldan, o, Əli ibn Numandan, o, İbn Miskandan, o da Əbu Bəsirdən belə nəql etmişdir:

“Əbu Abdullah (İmam Sadiq) (əleyhissəlam) mənə dedi: “Ey Əbu Muhəmməd, Allah-taala peyğəmbərlərə (əleyhimussəlam) nə vermişsə, həmin şeyi Muhəmmədə (sallallahu əleyhi və alihi və səlləm) də vermişdir. Allah peyğəmbərlərə verdiyi şeylərin hamısını, o cümlədən “**İbrahimin və Musanın səhifələri...**” – deyə buyurduğu səhifələri də Muhəmmədə (sallallahu əleyhi və alihi və səlləm) vermişdir”.

Dedim: “Sənə fəda olum, o səhifələr lövhələrdir?”

Buyurdu: “Bəli”.[56]

Əllamə Səffar səhih sənələ belə nəql etmişdir:

حدثنا أيوب بن نوح، عن صفوان بن يحيى، عن شعيب الخزاز، عن ضريس الكناسي قال: كنت عند أبي عبد الله عليه السلام وعنده أبو بصير، فقال أبو عبد الله عليه السلام: «إنّ داود ورّث سليمان، وإنّ سليمان ورث داود، وإن محمداً ورث سليمان وما هناك، وإنّا ورثنا محمداً، وإنّ عندنا صحف إبراهيم وألواح موسى.

فقال أبو بصير: إنّ هذا لهو العلم.

فقال: يا أبا محمد ليس هذا هو العلم، إنّما هو الأثر، إنّما العلم ما حدث بالليل والنهار، يوماً بيوم، وساعة بساعة.»

“Əyyub ibn Nuh bizə Səfvan ibn Yəhyadan, o, Şüeyb əl-Xəzzardan, o da Zureys əl-Kunasidən nəql edib dedi:

“Mən Əbu Abdullahın (İmam Sadiq) (əleyhissəlam) yanında idim. Əbu Bəsir də orada idi. Əbu Abdullah (əleyhissəlam) buyurdu: “Davud Süleymana irs qoydu, Süleyman da Davuddan (əleyhiməssəlam) irs apardı. Muhəmməd (sallallahu əleyhi və alihi və səlləm) də Süleymandan orada olanları irs apardı. Biz də Muhəmməddən (sallallahu əleyhi və alihi və səlləm) irs aldıq. İbrahimin səhifələri və Musanın lövhələri bizim yanımızdadır”.

Əbu Bəsir dedi: “Həqiqətən də elm məhz budur!”

Həzrət buyurdu: “Ey Əbu Muhəmməd! Elm bu deyil. Bu bir mirasdır. Elm gecə-gündüz, günbəgün, saatbasaat hasil olan şeydir”.

Bu rəvayəti qeyd etdikdən sonra Əllamə Səffar demişdir:

وروى محمد بن عيسى عن صفوان بهذا الإسناد مثل ذلك.

“Muhəmməd ibn İsa Səfvandan bu isnadla, eyniylə bu cür hədis nəql etmişdir”.[57]

---

56 “Əl-Kafi”, c.1, səh.225; “Bəsairud-dərəcat”, səh.156, səhih sənədlə.

57 “Bəsairud-dərəcat”, səh.138; “əl-Kafi”, c.1, səh.282, səhih sənədlə.

Siqətül-İslam Kuleyni öz sənədi ilə Müfəzzəl ibn Ömərdən Əbu Abdullah Cəfər ibn Muhəmməd əs-Sadiqin *(əleyhissəlam)* belə buyurduğunu nəql etmişdir:

إنّ سليمان ورث داود، وإنّ محمداً ورث سليمان، وإنّا ورثنا محمداً، وإنّ عندنا علم التوراة والإنجيل والزبور وتبيان ما في الألواح.

قال: قلت: إنّ هذا لهو العلم.

قال: ليس هذا هو العلم، إنّ العلم الذي يحدث يوماً بعد يوم، وساعة بعد ساعة.

"Süleyman Davuddan irs aldı, Muhəmməd Süleymandan irs aldı, biz də Muhəmməddən irs aldıq. Tövratın, İncilin, Zəburun elmi və lövhələrdə olan şeylərin izahı[58] bizim yanımızdadır".

Mən dedim: "Elm məhz budur".

Həzrət buyurdu: "Elm bu deyildir. Elm günbəgün, saatbasaat hasil olan şeydir".[59]

Siqətül-İslam Kuleyni səhih sənədlə belə nəql etmişdir:

محمد، عن أحمد بن محمد، عن الحسين بن سعيد، عن النضر بن سويد، عن عبد الله بن سنان، عن أبي عبد الله عليه السلام أنّه سأله عن قول الله عزّ وجل: {وَلَقَدْ كَتَبْنَا فِي الزَّبُورِ مِنْ بَعْدِ الذِّكْرِ}، ما الزبور وما الذكر؟

قال: «الذكر عند الله، والزبور الذي أنزل على داود، وكل كتاب نزل فهو عند أهل العلم ونحن هم.»

Muhəmməd, Əhməd ibn Muhəmməddən, o, Həsən ibn Səiddən, o, Nadr ibn Süveyddən, o da Abdullah ibn Sinandan belə nəql etmişdir ki, sonuncu, Əbu Abdullahdan (İmam Sadiqdən) (əleyhissəlam) "**Biz zikrdən sonra Zəburda yazmışıq ki...**" – ayəsindəki Zəburun və "zikr"in nədən ibarət olduğunu soruşdu. Əbu Abdullah buyurdu:

"Zikr Allah yanındadır. Zəbur isə Davuda (əleyhissəlam) nazil olan kitabdır. Bütün nazil olan kitablar elm əhlinin yanındadır, həmin elm əhli də bizik".[60]

İmamların (əleyhimussəlam) Allah Rəsulunun (sallallahu əleyhi və alihi və səlləm) elmini irs aldıqlarını bildirən, bu elmin onlara şifahi yolla, yaxud irs aldıqları kitablar yolu ilə keçdiyini bildirən rəvayətlər olduqca çoxdur. Müxtəsər olsun deyə, mən onların bəzisini qeyd etməklə kifayətləndim.

---

58 Yəni, səbəbləri və dəlilləri ilə birgə açıqlaması. (Mazandarani). [Müt.]

59 "Əl-Kafi", c.1, səh.281.

60 "Əl-Kafi", c.1, səh.225-226.

## Pak imamlar *(əleyhimussəlam)* mülhəm[61] və mühəddəsdirlər[62]

Məsum imamın elm əldə etdiyi yollardan biri də ilham yoludur. Bu zaman Allah tərəfindən onun mübarək qəlbinə elm, mərifət və haqq təlqin edilir. Digər bir yol isə mələklərin danışması yoludur. Bu iki yol imamların *(əleyhimussəlam)* elm əldə etdiyi mənbələrdəndir. Bu məsələ imamlardan *(əleyhimussəlam)* gəlib çatan səhih hədislərlə sübuta yetmişdir.

Əllamə Səffar "Bəsairüd-dərəcat" kitabında səhih sənədlə belə nəql etmişdir:

حدثنا أحمد ابن محمد، عن البرقي، عن النضر بن سويد، عن يحيى بن عمران، عن الحارث بن المغيرة عن أبي عبد الله عليه السلام قال: «إنّ الأرض لا تترك بغير عالم» قلت: الذي يعلمه عالمكم ما هو؟ قال: «وراثة من رسول الله صلى الله عليه وآله ومن علي بن أبي طالب عليه السلام، علم يستغني عن الناس ولا يستغني الناس عنه».

قلت: وحكمة يقذف في صدره أو ينكت في أذنه، قال: « ذاك وذاك».

"Əhməd ibn Muhəmməd bizə Bərqidən, o, Nadr ibn Süveyddən, o, Yəhya ibn İmrandan, o, Haris ibn Müğeyrədən belə nəql etmişdir:

"Əbu Abdullah (İmam Sadiq) (əleyhissəlam) buyurdu: "Yer üzü alimsiz buraxılmaz".

Mən dedim: "Sizin aliminizin bildiyi şey nədir?"

Buyurdu: "Allah Rəsulundan (sallallahu əleyhi və alihi və səlləm) və Əli ibn Əbi Talibdən (əleyhissəlam) qalan mirasdır. Elə bir elmdir ki, (onun sayəsində bizim alimimizin) camaata ehtiyacı olmur, camaatın isə ona daim ehtiyacı olur."

Dedim: "Bəs qəlbinə atılan və ya qulağına pıçıldanan hikmət (necə, o da sizin aliminizin elm mənbələrindəndir)?"

Buyurdu: "(Bəli), bu da, o da (yəni, hər ikisi də)".[63]

Əllamə Səffar səhih sənədlə nəql etmişdir:

حدثنا يعقوب بن يزيد، عن محمد بن إسماعيل بن بزيغ قال: سمعت أبا الحسن عليه السلام يقول: «الأئمة علماء صادقون مفهّمون محدّثون».

"Yaqub ibn Yezid bizə Muhəmməd ibn İsmayıl ibn Bəzidən nəql edib dedi: Əbül-Həsənin (əleyhissəlam) belə buyurduğunu eşitdim:

"İmamlar alim, doğruçu, müfəhhəm[64] və mühəddəsdirlər."[65]

---

[61] Mülhəm: ilham olunan deməkdir. [Müt.]

[62] Mühəddəs: mələklərin danışdığı kəs deməkdir. Hərfi mənada "mühəddəs" "danışılan kəs" deməkdir. Bu cür ifadə etməklə mələklərin imamlarla (əleyhimussəlam) danışması nəzərdə tutulur. [Müt.]

[63] "Bəsairud-dərəcat", səh.307.

Şeyx Numani "əl-Ğeybə" kitabında belə nəql etmişdir:

وأخبرنا أحمد بن محمد بن سعيد بن عقدة الكوفي، قال: حدثنا يحيى بن زكريا بن شيبان، في سنة ثلاث وسبعين ومائتين، قال: حدثنا علي بن سيف بن عميرة، قال: حدثنا أبان بن عثمان، عن زرارة عن أبي جعفر عليه السلام عن آبائه عليهم السلام قال: قال رسول الله صلى الله عليه وآله: «إنّ من أهل بيتي إثني عشر محدثاً».

فقال له رجل يقال له عبد الله بن زيد وكان أخا علي بن الحسين عليه السلام من الرضاعة سبحان الله محدّثاً؟ – كالمنكر لذلك – قال: فأقبل عليه أبو جعفر عليه السلام فقال له: «أما والله إنّ ابن أمّك كان كذلك» – يعني علي بن الحسين عليه السلام –.

"Bizə Əhməd ibn Muhəmməd ibn Səid ibn Uqdə əl-Kufi xəbər verib dedi: Yəhya ibn Zəkəriyya ibn Şeyban (hicri-qəməri) iki yüz yetmiş üçüncü (273-cü) ildə öz kitabından bizə nəql edib dedi:

"Əli ibn Yusif İbn Əmr bizə Əban ibn Osmandan, o, Zürarədən, o, Əbu Cəfər Muhəmməd ibn Əlidən (əleyhissəlam), o da ata-babalarından (əleyhimussəlam) nəql edib dedi:

"Allah Rəsulu (sallallahu əleyhi və alihi və səlləm) buyurmuşdur: "Həqiqətən, mənim Əhli-Beytimdən on iki mühəddəs şəxs vardır."

Bu zaman Əli ibn Hüseynin (əleyhissəlam) süd qardaşı Abdullah ibn Zeyd adlı bir şəxs inkar edirmiş kimi dedi: "Sübhanallah! Mühəddəs?!"

Ravi deyir: "Bu zaman Əbu Cəfər (əleyhissəlam) ona tərəf dönüb dedi: "(Bəli,) Allaha and olsun ki, sənin ananın oğlu da belə idi." Bununla Əli ibn Hüseyni (əleyhissəlam) nəzərdə tuturdu."[66]

Əllamə Səffar səhih sənədlə nəql etmişdir:

حدثنا أحمد بن محمد، عن الحسين بن سعيد، عن فضالة بن أيوب، عن داود بن فرقد، عن الحارث ابن المغيرة النصري قال: قلت لأبي عبد الله عليه السلام جعلت فداك الذي يسأل عنه الإمام وليس عنده فيه شيء من أين يعلمه؟ قال: «ينكت في القلب نكتاً أو ينقر في الأذن نقراً».

"Əhməd ibn Muhəmməd bizə Hüseyn ibn Səiddən, o, Fuzalə ibn Əyyubdan, o, Davud ibn Fərqəddən, o da Haris ibn Müğeyrədən nəql edib dedi:

---

[64] Müfəhhəm: yəni, başa salınan, dərk etdirilən. Əllamə Məclisi bu sözün izahında demişdir: "Allah Rəsulu *(sallallahu əleyhi və alihi və səlləm)* Quranı, onun təfsiri, təvili və digər elm və bilikləri imamlara *(öyrətmiş və)* başa salmışdır." ("Miratul-uqul", c.3, səh.164). [Müt.]

[65] "Bəsairud-dərəcat", səh.302; "əl-Kafi", c.1, səh.271.

[66] "Əl-Ğeybə", səh.66.

“Əbu Abdullaha (İmam Sadiqə) (əleyhissəlam) dedim: “Sənə fəda olum, əgər imamdan məlumatı olmadığı bir şey barədə soruşsalar, imam həmin şeyi(n hökmünü) haradan bilir?”

Buyurdu: “Qəlbə bir şey atılar və ya qulağa bir şey pıçıldanar.[67]”[68]

Əllamə Səffar səhih kimi sayılan həsən sənədlə belə nəql etmişdir:

حدثنا أحمد ابن محمد، عن الحسين بن سعيد، عن حمّاد بن عيسى، عن الحسين بن المختار، عن الحارث بن المغيرة النضري، عن حمران قال: (قال لي أبو جعفر عليه السلام: «إنّ عليّاً عليه السلام كان محدّثاً»، فخرجت إلى أصحابي فقلت لهم جئتكم بعجيبة، قالوا: ما هي؟

قلت: سمعت أبا جعفر عليه السلام يقول كان علي محدّثاً.

قالوا: ما صنعت شيئاً، ألا سألته من يحدّثه، فرجعت إليه فقلت له إني حدثت أصحابي بما حدّثتني، قالوا ما صنعت شيئاً ألا سألته من يحدّثه؟

فقال لي: «يحدّثه ملك».

قلت: فيقول إنّه نبي؟

قال: فحرّك يده هكذا ثم قال: «وكصاحب موسى أو كذي القرنين أوما بلغكم أنّه قال وفيكم مثله».

“Əhməd ibn Muhəmməd bizə Hüseyn ibn Səiddən, o, Həmmad ibn İsadan, o, Hüseyn ibn Muxtardan, o, Haris ibn Müğeyrə ən-Nadridən, o da Humrandan belə nəql etmişdir:

“Əbu Cəfər (əleyhissəlam) mənə dedi: “Həqiqətən də Əli (əleyhissəlam) mühəddəs idi.” Mən öz yoldaşlarımın yanına gedib onlara dedim: “Sizə qəribə bir xəbər gətirmişəm”.

Dedilər: “Nədir o?”

Dedim: “Əbu Cəfərin (əleyhissəlam) “Əli mühəddəs idi”, – dediyini eşitdim”.

Onlar dedilər: “Bir şey etməmisən. Nə üçün soruşmadın ki, onunla kim danışırdı?”[69]

Mən Əbu Cəfərin (əleyhissəlam) yanına qayıdıb ona dedim: “Sizin mənə dediyiniz sözü yoldaşlarıma dedim, onlar dedilər ki, bir şey etməmisən, nə üçün soruşmadın ki, onunla kim danışırdı?”

Mənə dedi: “Onunla mələk danışırdı”.

Mən dedim: “Deyirsiniz ki, o peyğəmbər olub?”

O, bu şəkildə əlini tərpədib dedi: “(Əsla!) O, (Süleymanın yoldaşı kimi idi),[70] Musanın yoldaşı kimi idi, Zülqərneyn kimi idi. Məgər sizə gəlib

---

[67] “Qəlbə bir şey atılar” deyildikdə, qəlbə ilham olunması, “qulağa bir şey pıçıldanar” deyildikdə isə mələyin qulağa söz deməsi nəzərdə tutulur. [Müt.]

[68] “Bəsairud-dərəcat”, səh.336.

[69] Yuxarıda qeyd etdiyimiz kimi, “mühəddəs” “onunla danışılan şəxs” deməkdir. [Müt.]

çatmayıb ki, (Peyğəmbər) onun barəsində, "Sizin aranızda onun kimi[71] birisi vardır" – deyə buyurmuşdur?"[72]

Əllamə Səffar səhih kimi sayılan həsən sənədlə belə nəql etmişdir:

حدثنا محمد ابن الحسين، عن صفوان، عن عبد الله بن مسكان، عن حجر بن زائدة عن حمران بن أعين أنّه قال لأبي عبد الله عليه السلام: إنّ فلاناً حدّثني أنّ أبا جعفر عليه السلام حدّثه أنّ عليّاً عليه السلام والحسن كانا محدّثين.

قال: «كيف حدّثك؟»

قلت: حدثني أنّه كان ينكت في أذنيهما.

قال: «صدق».

"Muhəmməd ibn Hüseyn bizə Səfvandan, o, Abdullah ibn Miskandan, o, Hicr ibn Zaidədən, o da Hümran ibn Əyəndən belə nəql etmişdir:

"Əbu Abdullaha (İmam Sadiqə) (əleyhissəlam) dedim: "Filankəs mənə belə nəql etdi ki, Əbu Cəfər (əleyhissəlam) ona belə danışıb: "Əli və Həsən (əleyhiməssəlam) mühəddəs olublar."

Əbu Abdullah (əleyhissəlam) buyurdu: "O şəxs (bu hədisi) sənə necə nəql etdi?"

Dedim: "Belə nəql etdi ki, onların qulaqlarına pıçıldayardılar."

Buyurdu: "Düz deyib."[73]

Əllamə Səffar "Bəsairud-dərəcat" kitabında səhih sənədlə nəql etmişdir:

حدثنا محمد بن الحسين، عن أحمد بن محمد بن أبي نصر، عن عبد الكريم، عن ابن أبي يعفور قال: قلت لأبي عبد الله عليه السلام إنّا نقول إنّ عليّاً عليه السلام كان ينكت في قلبه أو صدره أو في أذنه.

فقال: «إنّ عليّاً عليه السلام كان محدّثاً».

قلت: فيكم مثله؟

قال: «إنّ عليّاً كان محدّثاً»، فلما أن كررت عليه قال: «إنّ عليّاً عليه السلام كان يوم بني قريظة والنضير كان جبرائيل عن يمينه وميكائيل عن يساره يحدّثانه».

"Muhəmməd ibn Hüseyn bizə Əhməd ibn Muhəmməd ibn Əbu Nəsirdən, o, Əbdül-Kərimdən, o da İbn Əbu Yəfurdan nəql edib dedi:

---

70 Bu cümlə "Əl-Kafi"də qeyd edilmişdir. [Müt.]

71 Zülqərneyn kimi. [Müt.]

72 "Bəsairud-dərəcat", səh.342; "əl-Kafi", c.1, səh.271.

73 "Bəsairud-dərəcat", səh.341.

“Əbu Abdullaha (İmam Sadiqə) (əleyhissəlam) dedim: “Biz deyirik ki, Əlinin (əleyhissəlam) qəlbinə, ya sinəsinə, yaxud da qulağına (elm) gəlirdi”.

Buyurdu: “Əli (əleyhissəlam) mühəddəs idi”.

Dedim: “Sizin aranızda da onun kimisi var?”

Buyurdu: “Əli mühəddəs idi.”

Elə ki mən sualı bir daha təkrar etdim, İmam dedi: “Bəni-Qureyzə və Bəni-Nüzeyr(lə döyüş) günü Cəbrail Əlinin (əleyhissəlam) sağından, Mikayıl da solundan onunla danışırdı”.[74]

Əllamə Məclisi “Biharul-ənvar” kitabında “Bəsairud-dərəcat” kitabından nəqlən səhih sənədlə belə nəql etmişdir:

بصائر الدرجات: عباس بن معروف، عن حمّاد ابن عيسى، عن حريز، عن زرارة قال: قلت لأبي عبد الله عليه السلام: إنّ أباك حدثني أنّ عليّاً والحسن والحسين عليهم السلام كانوا محدّثين؟

قال: فقال: «كيف حدّثك؟»

قلت: حدثني أنّه كان ينكت في آذانهم.

قال: «صدق أبي».

“Bəsairud-dərəcat”: Abbas ibn Məruf, Həmmad ibn İsadan, o, Hərizdən, o da Zürarədən belə nəql etmişdir:

“Əbu Abdullaha (İmam Sadiqə) (əleyhissəlam) dedim: “Atanız mənə Əli, Həsən və Hüseynin (əleyhimussəlam) mühəddəs olduqlarını deyib.”

Buyurdu: “Necə deyib?”

Dedim: “Onların qulaqlarına pıçıldandığını deyib.”

Buyurdu: “Atam düz deyib.”[75]

Əllamə Səffar müvəssəq sənədlə belə nəql etmişdir:

حدثنا أحمد بن محمد، عن العباس بن معروف، والحسين بن سعيد، عن حمّاد بن عيسى، عن الحسين بن المختار، عن أبي بصير عن أبي عبد الله عليه السلام قال: («كان علي عليه السلام محدّثاً، وكان سلمان محدّثاً».

قال: قلت: فما آية المحدّث؟

قال: «يأتيه ملك فينكت في قلبه كيت وكيت».

“Əhməd ibn Muhəmməd bizə Abbas ibn Məruf və Hüseyn ibn Səiddən, onlar Həmmad ibn İsadan, o, Hüseyn ibn Muxtardan, o da Əbu Bəsirdən nəql edib dedi:

---

[74] “Bəsairud-dərəcat”, səh.342-343.

[75] “Biharul-ənvar”, c.26, səh.69.

“Əbu Abdullah (İmam Sadiq) (əleyhissəlam) buyurdu: “Əli (əleyhissəlam) mühəddəs idi, Salman mühəddəs idi”.

Dedim: “Mühəddəs şəxsin əlaməti nədir?”

Buyurdu: “Bir mələk gəlib onun qəlbinə “filandır”, “filan cürdür”, - deyə (məlumat) atar”.[76]

Siqətül-İslam Şeyx Kuleyni səhih sənədlə belə nəql etmişdir:

محمد بن يحيى، عن أحمد بن محمد، عن محمد بن إسماعيل، عن عمّه حمزة بن بزيغ، عن علي السائي، عن أبي الحسن الأول موسى عليه السلام قال: قال: «مبلغ علمنا على ثلاثة وجوه: ماض وغابر وحادث، فأمّا الماضي فمفسّر، وأمّا الغابر فمزبور، وأمّا الحادث فقذف في القلوب ونقر في الأسماع وهو أفضل علمنا ولا نبي بعد نبيّنا».

Muhəmməd ibn Yəhya, Əhməd ibn Muhəmməddən, o, Muhəmməd ibn İsmayıldan, o, əmisi Həmzə ibn Bəziğdən, o, Əli əs-Saidən, o da birinci Əbül-Həsəndən (əleyhissəlam) belə nəql etmişdir:

“Bizim elmimiz üç şeyə çatır: keçmişə,[77] gələcəyə[78] və yeni baş verənlərə.[79] Keçmiş izah olunmuşdur.[80] Gələcək yazılmışdır.[81] Yeni baş verənlər isə qəlblərə atılar, qulaqlara deyilər. Bu, bizim elmimizin ən üstün növüdür. Bizim Peyğəmbərimizdən sonra peyğəmbər yoxdur”.[82]

Şeyx Kuleyni səhih sənədlə belə nəql etmişdir:

عدة من أصحابنا، عن أحمد بن محمد، عن الحسين بن سعيد، عن النضر بن سويد، عن يحيى الحلبي، عن أبي الصباح الكناني، عن أبي بصير قال: سألت أبا عبد الله عليه السلام عن قول الله تبارك وتعالى: {وَكَذَلِكَ أَوْحَيْنَا إِلَيْكَ رُوحاً مِنْ أَمْرِنَا مَا كُنْتَ تَدْرِي مَا الْكِتَابُ وَلا الْإِيمَانُ} قال: «خلق من خلق الله عزّ وجل أعظم من جبرائيل وميكائيل كان مع رسول الله صلى الله عليه وآله يخبره ويسدده، وهو مع الأئمة من بعده».

---

76 “Bəsairud-dərəcat”, səh.342.

77 Keçmişdə baş verən hadisələr. [Müt.]

78 Gələcəkdə baş verəcək qəti hadisələr. [Müt.]

79 Qeyri-qəti *(qeyri-məhtum)* olan hadisələrdə ilahi hökmün dəyişməsidir. Bu zaman imamlar (əleyhimussəlam) həm dəyişilən hökmdən, həm də dəyişilən hökmün yerinə gələn qəti hökmdən xəbərdar olarlar. (Mazandarani, Məclisi).

Əlbəttə, bu söz üçün başqa bir məna da düşünülə bilər. Belə ki, daha öncəki hədislərə əsasən, ifadəni belə də izah etmək olar: Qarşıya yeni bir məsələ çıxarsa *(daha sonra qeyd olunacaq Muhəmməd ibn Müslimin hədisi)*, yaxud İmamdan daha öncə xəbəri olmadığı bir şey soruşularsa *(Haris ibn Müğeyrənin hədisi)*, həmin məsələ İmama ilham olunar. [Müt.]

80 Yəni, bunları Peyğəmbərimiz *(sallallahu əleyhi və alihi və səlləm)* bizə izah etmişdir. (Mazandarani, Məclisi) [Müt.]

81 Yəni, gələcəkdə baş verən qəti hadisələr Peyğəmbərin (sallallahu əleyhi və alihi və səlləm) diktəsi, İmam Əlinin (əleyhissəlam) dəst-xətti ilə olan “Camiə”, “Müshəfi-Fatimə (səlamullahi əleyha)” və s. kitab və toplularda yazılmışdır. (Mazandarani, Məclisi). [Müt.]

82 “Əl-Kafi”, c.1, səh.264.

“Əshabımızdan olan bir dəstə Əhməd ibn Muhəmməddən, o, Hüseyn ibn Səiddən, o, Nazr ibn Süveyddən, o, Yəhya əl-Hələbidən, o, Əbus-Sabbah əl-Kinanidən, o da Əbu Bəsirdən belə nəql etmişdir:

“Əbu Abdullahdan (İmam Sadiqdən) (əleyhissəlam) “**Sənə də beləcə əmrimizdən olan bir ruh göndərdik. Sən (bundan əvvəl) kitab nədir, iman nədir bilməzdin**”[83] ayəsi(ndəki “ruh”) barədə soruşdum.

Buyurdu: “O, Allahın məxluqatından biridir. Cəbrail və Mikaildən daha böyükdür. O, Allah Rəsulu (sallallahu əleyhi və alihi və səlləm) ilə birgə idi, ona xəbər verər, onu (xətaya düşməkdən) qoruyardı. O, Allah Rəsulundan (sallallahu əleyhi və alihi və səlləm) sonra imamlarla birgədir”.[84]

Əllamə Səffar müvəssəq və ya səhih bir sənədlə belə nəql etmişdir:

حدثنا محمد بن عبد الحميد، عن منصور بن يونس، عن أبي بصير قال: قلت لأبي عبد الله عليه السلام جعلت فداك عن قول الله تبارك وتعالى: {كَذَلِكَ أَوْحَيْنَا إِلَيْكَ رُوحًا مِنْ أَمْرِنَا مَا كُنْتَ تَدْرِي مَا الْكِتَابُ وَلَا الْإِيمَانُ وَلَكِنْ جَعَلْنَاهُ نُورًا نَهْدِي بِهِ مَنْ نَشَاءُ مِنْ عِبَادِنَا وَإِنَّكَ لَتَهْدِي إِلَى صِرَاطٍ مُسْتَقِيمٍ * صِرَاطِ اللهِ الَّذِي لَهُ مَا فِي السَّمَاوَاتِ وَمَا فِي الْأَرْضِ أَلَا إِلَى اللهِ تَصِيرُ الْأُمُورُ} قال يا أبا محمد خلق والله أعظم من جبرائيل وميكائيل كان مع رسول الله صلى الله عليه وآله يخبره ويسدده وهو مع الأئمة يخبرهم ويسددهم.

“Muhəmməd ibn Əbdül-Həmid bizə Mənsur ibn Yunisdan, o da Əbu Bəsirdən belə nəql etmişdir:

“Əbu Abdullaha (İmam Sadiqə) (əleyhissəlam) dedim: “Sənə fəda olum, bu ayələr barədə soruşmaq istəyirəm: “**Sənə də beləcə əmrimizdən olan bir ruh göndərdik. Sən (bundan əvvəl) kitab nədir, iman nədir bilməzdin. Lakin, Biz onu bəndələrimizdən dilədiyimizi haqq yola qovuşdurmağımız üçün bir nur etdik. Sən (onunla insanları) düz yola yönəldirsən. O Allahın yoluna ki, göylərdə və yerdə nə varsa (hamısı) Onundur. Bil ki, bütün işlər axırda Allaha qayıdacaqdır!**”[85]

Buyurdu: “Ey Əbu Muhəmməd, (burada qeyd edilən “ruh”) Allaha and olsun ki, Cəbrail və Mikaildən daha böyük varlıqdır. O, Allah Rəsulu (sallallahu əleyhi və alihi və səlləm) ilə birgə idi, ona xəbər verər və onu qoruyardı. O, (Peyğəmbərdən sonra da) imamlarladır, onlara xəbər verir, onları (xətaya düşməkdən) qoruyur”.[86]

Həmçinin, səhih sənədlə belə nəql etmişdir:

---

[83] Şura surəsi, 52-ci ayə.
[84] “Əl-Kafi”, c.1, səh.273; “Bəsairud-dərəcat”, səh.475, səhih sənədlə.
[85] Şura surəsi, 52 və 53-cü ayələr.
[86] “Bəsairud-dərəcat”, səh.475.

حدثنا أحمد بن محمد بن عيسى، عن أحمد ابن محمد بن أبي نصر البزنطي، عن عاصم عن محمد بن مسلم عن الإمام أبي جعفر الباقر عليه السلام في قول الله عزّ وجل: {وَكَذَلِكَ أَوْحَيْنَا إِلَيْكَ رُوحاً مِنْ أَمْرِنَا مَا كُنْتَ تَدْرِي مَا الْكِتَابُ وَلا الْإِيمَانُ} فقال: «خلق من خلق الله أعظم من جبرائيل وميكائيل كان مع رسول الله صلى الله عليه وآله يخبره ويسدده وهو مع الأئمة من بعده».

"Əhməd ibn Muhəmməd ibn İsa bizə Əhməd ibn Muhəmməd ibn Əbu Nəsr əl-Bəzəntidən, o, Asimdən, o da Muhəmməd ibn Müslimdən belə nəql etmişdir:

"Əbu Cəfər Baqir (əleyhissəlam) "**Sənə də beləcə əmrimizdən olan bir ruh göndərdik. Sən (bundan əvvəl) kitab nədir, iman nədir bilməzdin**" – ayəsi barədə buyurdu: "(Ayədəki "ruh") Allahın məxluqatından biridir. Cəbrail və Mikaildən daha böyükdür. O, Allah Rəsulu (sallallahu əleyhi və alihi və səlləm) ilə birgə idi, ona xəbər verər, onu (xətaya düşməkdən) qoruyardı. O, Allah Rəsulundan (sallallahu əleyhi və alihi və səlləm) sonra imamlarla birgədir".[87]

Yenə səhih sənədlə belə nəql etmişdir:

حدثنا محمد بن الحسين، عن الحسن بن محبوب، عن العلاء بن رزين، عن محمد بن مسلم، عن أبي جعفر عليه السلام قال: «كان علي يعمل بكتاب الله وسنّة رسوله، فإذا ورد شيءٌ والحادث الذي ليس في الكتاب ولا في السنة ألهمه الله الحق فيه إلهاما، وذلك والله من المعضلات».

Muhəmməd ibn Hüseyn bizə Həsən ibn Məhbubdan, o, Əla ibn Rəzindən, o, Muhəmməd ibn Müslimdən, o da Əbu Cəfərdən (əleyhissəlam) belə nəql etmişdir:

"Əli (əleyhissəlam) Allahın kitabı və Allah Rəsulunun (sallallahu əleyhi və alihi və səlləm) sünnəsinə əməl edirdi. Əgər sünnədə və Quranda olmayan bir şey qarşısına çıxsaydı, Allah həmin məsələdə həqiqətin nə olduğunu ona ilham edirdi. Bu, Allaha and olsun ki, çətin işlərdəndir.[88]"[89]

Şiələrin öz İmamlarını *(əleyhimussəlam)* mühəddəs və mülhəm hesab etməsi bəzi şiə düşmənlərinin iddia etdiyi kimi "ğüluv"[90] deyildir. Əhli-sünnə məzhəbinin alimləri Ömər ibn əl-Xəttabın Mədinədə xütbə edərkən özündən min kilometrlərlə uzaqlıqda olan müsəlman qoşununun halından xəbərdar olduğunu, sonra da oturduğu yerdən qoşunun başçısı Sariyə adlı

[87] "Bəsairud-dərəcat", səh.477.
[88] Yəni, insanların asanlıqla dərk edə bilməyəcəkləri, yaxud qəbul edə bilməyəcəkləri məsələlərdəndir. [Müt.]
[89] "Bəsairud-dərəcat", səh.254.
[90] Dini inanc və şəxs haqqında ifrat baxış, mübaliğə. [Müt.]

şəxsə səslənərək öz təlimatlarını verdiyini nəql etmişlər. Əbdür-Rəqib ibn Əli əl-İbi deyir:

وقال عبد الله بن أحمد في زوائده على «الفضائل»: حدثنا أبو عمرو الحارث بن مسكين المصري، ثنا ابن وهب عن يحيى بن أيوب عن ابن عجلان عن نافع عن عبد الله بن عمر: أنّ عمر بن الخطاب بعث جيشاً وأمّر عليهم رجلاً يدعى سارية، قال: فبينا عمر يخطب الناس يوماً، قال: فجعل يصيح وهو على المنبر: «يا ساري الجبل يا ساري الجبل»، فقدم رسول الجيش فسأله، فقال: يا أمير المؤمنين لقينا عدونا فهزمنا فإذا بصايح يصيح: يا ساري الجبل يا ساري الجبل، فأسندنا ظهورنا بالجبل فهزمهم الله، فقيل لعمر – يعني ابن الخطاب– إنك كنت تصيح بذلك.

قال ابن عجلان: وحدثني إياس بن معاوية بن قرة بمثل ذلك.

هذا أثر إسناده حسن رواه الآجري في «الشريعة» وأورده الحافظ ابن كثير في «البداية والنهاية» وقال: هذا إسناد جيد حسن، وعزاه الحافظ في «الإصابة» إلى البيهقي في «الدلائل» واللالكائي في «شرح النسة» والزين عاقولي في «فوائده» وابن الأعرابي في «كرامات الأولياء» وحرملة في جمعه لحديث ابن وهب وقال: وهو إسناد حسن.

*"Abdullah ibn Əhməd "Fəzail" kitabına etdiyi əlavələrdə belə demişdir: "Bizə Əbu Əmr əl-Haris ibn Miskin əl-Misri nəql edib dedi: "İbn Vəhb bizə Yəhya ibn Əyyubdan, o, İbn İclandan, o, Nafidən, o da Abdullah ibn Ömərdən belə nəql etmişdir:*

*"Ömər ibn əl-Xəttab döyüşə bir qoşun göndərdi. Qoşuna Sariyə adlı bir şəxsi başçı qoydu. Bir gün Ömər ibn əl-Xəttab camaata xütbə edərkən minbərin üzərində qışqıraraq belə deməyə başladı: "Ey Sariyə, dağa tərəf! Ey Sariyə, dağa tərəf!" (Bir müddət sonra) qoşun tərəfindən bir elçi gəlib Ömərə dedi: "Ey möminlərin əmiri, düşmənlə qarşılaşdıq və məğlub olub geri çəkildik, bu zaman bir nəfərin: "Ey Sariyə, dağa tərəf! Ey Sariyə, dağa tərəf!", - deyə qışqırdığını eşitdik. Bundan sonra arxamızı dağa yasladıq. Beləcə Allah onları məğlub etdi." Bu vaxt Ömərə dedilər: "Sən bu cür qışqırırdın".*

*İbn İclan demişdir: Mənə İyas ibn Müaviyə ibn Qürrə də bu cür bir xəbər nəql etmişdir.*

*Bu, sənədi **həsən** olan bir xəbərdir. Bunu əl-Acurri "əş-Şəriə"də nəql etmişdir. Hafiz İbn Kəsir bunu "əl-Bidayə vən-Nihayə" kitabında nəql etmiş və demişdir: "**Bu, ceyyid[91] və həsən[92] sənəddir**." Həmçinin, Hafiz (İbn Həcər) "əl-İsabə"də demişdir ki, bu hədisi Beyhəqi "əd-Dəlail"də, əl-Laləkai "Şərhüs-sünnə"də, Zeyn Aquli "Favaid"də, İbn əl-Ərabi "Kəramatul-əliya"da, Hərmələ də*

---

[91] Səhih hədisdən daha aşağı, həsən hədisdən daha yuxarı olan hədis növüdür. Bax: "Mucəmul-mustalahatul-hədisiyyə": səh. 109. [Müt.].

[92] Sənədi bitişik olan, illətli (nöqsanlı) və şazz (məşhurun ziddinə) olmayan, raviləri ədalətli olan, lakin aralarında yaddaşı bir qədər zəif olan şəxs olan hədisə "həsən hədis" deyilir. Bu qeyd olunan 2 hədis növünün hər ikisi mötəbər hədis növləri sayılır. Bax: "Mucəmul-mustalahatul-hədisiyyə": səh. 312. [Müt.].

*İbn Vəhbin hədislərini topladığı kitabında nəql etmdir. (Sonra İbn Həcər) demişdir: "**Bu, həsən sənəddir**."*[93]

Bundan sonra Əbdür-Rəqib əl-İbi, Albaninin "əl-Mişkat"ın hədislərinə verdiyi şərhində bu hədisi "**həsən**" hesab etdiyini qeyd etmiş, ardınca Albaninin "Silsilətul-əhadisis-səhihə" kitabında bu hədisi inkar edənlərə cavab (rəddiyyə) verdiyini demişdir. Həmçinin, o, İbn Həcərin hədisi həsən bilməsini də qeyd etmişdir.[94]

Bir çox sünni alimlərin bu hədisi "**həsən**" hesab etməsindən də anlaşıldığı kimi, hədis sünnilərin nəzərində mötəbərdir.

Buna görə də, sual veririk: Ömər ibn əl-Xəttab qoşunun vəziyyətini necə bilmişdir? Görəsən, Ömər qoşunun məğlub olduğundan necə xəbərdar olmuşdur?

Bunun üçün yalnız iki yol düşünülə bilər, üçüncü bir yol yoxdur. Bu iki yol ilham və mələklərin danışması yoludur. Əgər desələr ki, Ömər bunu ilham yolu ilə bilmişdir, deyərik ki, şiələrin yanında da səhih və açıq dəlillərlə sübuta yetmişdir ki, onların İmamlarına (əleyhimus-səlam) ilham olunur. Əgər əhli-sünnənin Ömər barədə iddia etdiyi bu şey ğüluv sayılmırsa, şiələrin öz imamları barədə dedikləri bu söz də ğüluv sayılmır.

Əgər onlar Ömərin bu işi mələyin xəbər verməsi yolu ilə bildiyini desələr, o zaman deyərik ki, mələklərin şiələrin imamları (əleyhimussəlam) ilə danışması şiə mənbələrindəki səhih dəlillərlə sübuta yetmişdir. Əgər onların Ömər barədə iddia etdikləri bu iş ğüluv sayılmırsa, şiələrin də öz imamları barədə dedikləri söz də ğüluv sayılmır.

Həmçinin, onlar nəql ediblər ki:

أن عمر بن الخطاب قال لرجل ما اسمك؟ فقال جمرة، فقال ابن من؟ فقال ابن شهاب، قال ممن؟ قال من الحرقة، قال أين مسكنك؟ قال بحرة النار؟ قال بأيها؟ قال بذات لظى، قال عمر: أدرك أهلك فقد احترقوا، قال فكان كما قال عمر بن الخطاب!

*"Ömər ibn əl-Xəttab bir nəfərə dedi: "Adın nədir?"*
*Həmin şəxs dedi: "Cəmrə (köz parçası, kösöv)".*
*Ömər dedi: "Kimin oğlusan?"*
*Dedi: "Şihabın (meteor) oğluyam".*
*Ömər dedi: "Hansı qəbilədənsən?"*
*Dedi: "Hurqə (yanğı) qəbiləsindən".*
*Ömər dedi: "Yaşadığın yer haradır?"*

---

[93] "Kəramatul-əvliya", səh.68-69.
[94] Həmin mənbə.

*Həmin şəxs dedi: "Hərrətun-Nar".*[95]
*Ömər dedi: "Oranın harasında (yaşayırsan)?"*
*Dedi: "Zatul-ləzada" (odlu, alovlu yer).*[96]
*Ömər dedi: "Özünü ailənə yetir, yandılar".*
*Ravi deyir: "Elə Ömər ibn Xəttabın dediyi kimi də oldu!"*[97]

Az öncəki hədis üçün deyilən sözlər bu hədis üçün də keçərlidir.

Şiə kitablarında Əhli-Beyt İmamlarının *(əleyhimussəlam)* mühəddəs olduqlarını bildirən rəvayətlər mövcud olduğu üçün bəzi nadan şiə düşmənləri mələklərin danışması ilə peyğəmbərlik arasında qırılmaz əlaqə olduğunu zənn etmişlər. Buna görə də onlar şiələrin həzrət Muhəmmədin *(sallallahu əleyhi və alihi və səlləm)* peyğəmbərliyinin sonuncu peyğəmbərlik olduğuna etiqad bəsləmədiklərini iddia etmişlər. Həqiqətdə isə mələklərin bir şəxslə danışması ilə peyğəmbərlik arasında qırılmaz əlaqə yoxdur. Mələklərin danışdıqları kəslərin peyğəmbər olması vacib deyil. Qurani-Kərim mələklərin bəzi xanımlarla danışdığını, Allahın bəzi xanımlara vəhy etdiyini bizə xəbər vermişdir. Halbuki, bu xanımlar peyğəmbər olmamışlar. Qurani-Kərim bildirmişdir ki, mələklər xanım Məryəm *(əleyhassəlam)* ilə danışmış, Allahın onu seçdiyini, pakladığını və dünya xanımlarından üstün tutduğunu ona xəbər vermişlər. Allah-taala buyurmuşdur: "**(Xatırla ki,) bir zamanlar mələklər belə demişdilər: "Ya Məryəm, həqiqətən, Allah səni seçmiş, təmizləmiş, aləmlərin qadınlarından üstün tutmuşdur**".[98] Həmçinin, Quran bizə bildirir ki, mələklər onunla danışaraq onu həzrət İsa Məsih *(əleyhissəlam)* ilə müjdələmişlər: "**Mələklər dedilər: "Ya Məryəm! Həqiqətən, Allah Öz tərəfindən bir kəlmə ilə sənə müjdə verir. Onun adı Məryəm oğlu İsa əl-Məsihdir ki, dünyada və axirətdə şanı uca (şərəfli) və (Allaha) yaxın olanlardandır**".[99] Həmçinin, Quran bizə xəbər verir ki, mələklər həzrət İbrahimin *(əleyhissəlam)* həyat yoldaşı ilə danışaraq ona bir övladının olacağını müjdə vermişlər: **"(İbrahimin) arvadı (Sara pərdə arxasında) durmuşdu (və ya qonaqlara qulluq edirdi). O (bu sözləri eşidib Lut tayfasının başına gələcək müsibətdən qafil olduğuna sevinərək və ya qoca yaşında oğlu olacağına təəccüblənərək) güldü.**

---

[95] Məntəqə adıdır. Hərfi tərcüməsi: "hərrə": sanki yanmış kimi görünən qara ağaclar olan yerdir, "nar": od deməkdir. [Müt.]

[96] Zatul-ləza: "Hərrətun-nar" məntəqəsində Xeybər ilə Teyma arasında yerləşən yer adıdır. [Müt.]

[97] "Müvəttə" (Malik), c.2, səh.973, № 1753; "Əvnul-məbud", c.10, səh.296; "Tarixi-Diməşq", c.44, səh.281; "Əxbarul-Mədinə", səh.400, № 1276; "Tarixul-xüləfa", səh.126; "Əs-Səvaiqul-muhriqə", c.1, səh.249.

[98] Ali-İmran surəsi, 42-ci ayə.

[99] Ali-İmran surəsi, 45-ci ayə

**Bundan sonra Biz onu İshaqla, İshaqın da ardınca Yəqubla müjdələdik. (İbrahimin arvadı) dedi: "Vay halıma! Mən qoca bir qarı, bu ərim də ixtiyar bir kişi olduğu halda, mən necə doğa bilərəm?! Bu, çox təəccüblü bir şeydir!" (Mələklər ona) dedilər: "Allahın əmrinə (əmr etdiyi bir şeyə) təəccübmü edirsən? Ey ev əhli! Allahın bərəkəti və mərhəməti üstünüzdə olsun. Allah təriflənib şükür olunmağa, öyünüb mədh edilməyə layiqdir!"***[100]* Quran bizə xəbər verir ki, Allah-taala həzrət Musanın *(əleyhissəlam)* anasına vəhy etmişdir: "**Biz Musanın anasına "Onu (Musanı) əmizdir; elə ki ondan ötrü qorxdun, onu dəryaya (Nil çayına) at. (Uşağın suda boğulacağından) qorxma və (ayrılığına da) kədərlənmə. Biz onu sənə qaytaracaq, özünü də (şəriət sahibi olan) peyğəmbərlərdən edəcəyik!" – deyə vəhy etdik**".[101]

Qurani-Kərimin söz açdığı bu xanımlar peyğəmbər olmamışlar. Bunula yanaşı, mələkləri müşahidə etmiş, onlarla danışmışlar, habelə onlardan bəzilərinə ilham edilmişdir. Bütün bunları Qurani-Kərim xəbər vermişdir, elə isə kimsə bunları inkar edə bilməz.

Əhli-sünnə alimləri Əbu Hüreyrədən belə nəql etmişlər:

قال رسول الله صلى الله عليه وسلم: لقد كان فيما قبلكم من الأمم ناس محدثون، فإن يك في أمتي أحدٌ فإنّه عمر.

"Allah Rəsulu (sallallahu əleyhi [və alihi] və səlləm) buyurdu: "Sizdən əvvəlki ümmətlər arasında mühəddəs şəxslər olmuşdur. Əgər mənim ümmətim arasında (belə bir şəxs) olsa, mütləq Ömər olar".

Zəkəriyyə ibn Əbu Zaidə isə Əbu Hüreyrədən belə nəql etmişdir:

زكريا بن أبي زائدة عن سعد عن أبي سلمة عن أبي هريرة قال: قال النبي صلى الله عليه وسلم: لقد كان فيمن كان قبلكم من بني إسرائيل رجال يكلمون من غير أن يكونوا أنبياء فإن يكن من أمتي منهم أحد فعمر.

"Sizdən öncə Bəni-İsrail arasında bəzi şəxslər olmuşdur ki, peyğəmbər olmadıqları halda (mələklər) onlarla danışmışdır. Əgər mənim ümmətim arasında onlar kimi bir şəxs olsa, mütləq Ömər olar".[102]

Bu hədis bizim yuxarıda qeyd etdiyimiz məsələni təsdiq edərək göstərir ki, mələklərin bir şəxslə danışması üçün həmin şəxsin peyğəmbər olmasına ehtiyac yoxdur. Hədis mələklərin Bəni-İsrail arasında peyğəmbər olmayan bəzi şəxslərlə danışıdıqlarını sübut edir.

Sünnilərin bəzi alimləri hədisdəki danışıqdan məqsədin ilham olduğunu demişlər.

---

100 Hud surəsi, 71,72 və 73-cü ayələr.

101 Qasas surəsi, 7-ci ayə.

102 "Səhihul-Buxari", c.3, səh.1349, №3486.

İbn əl-Əsir demişdir:

قد كان في الأمم محدثون، فإن يكن في أمتي أحدٌ فعمر بن الخطاب جاء في الحديث تفسيره أنهم الملهمون، والملهم هو الذي يلقي في نفسه الشيء فيخبر به حدساً وفراسة، وهو نوع يختص به الله عز وجل من يشاء من عبادة الذين اصطفى مثل عمر كأنهم حدثوا بشيء فقالوه.

"Ümmətlər arasında mühəddəs şəxslər olmuşdur. Əgər mənim ümmətim arasında (belə) bir şəxs olsa, Ömər ibn əl-Xəttab olar. Hədisdə mühəddəs sözünün təfsiri gəlmişdir. Onun ilham olunan şəxs olduğu bildirilmişdir. İlham olunan şəxs ürəyinə bir şey atılan və həmin şeyi intuiktiv və hissi yolla xəbər verən şəxsdir. Bu, Allahın seçilmiş bəndələri arasından dilədiyi – məsələn, Ömər kimi – şəxslərə verdiyi xüsusi bir nemətdir. (Belə şəxslərə ona görə "mühəddəs" – "danışılan şəxslər" deyirlər ki,) sanki onlara nəsə deyilir, onlar da həmin şeyi deyirlər".[103]

Onların bir qism digər alimləri isə "mühəddəs"dən məqsədin "mələklərin danışdığı şəxs" olduğunu demişlər. Muhəmməd ibn Əbdül-Vəhhab demişdir:

ما رواه مسلم عن عائشة قال رسول الله صلى الله عليه وسلم قد كان فيمن خلا من الأمم أناس محدثون فإن يكن في أمتي أحد منهم فهو عمر وهو في المسند والترمذي من حديث أبي هريرة والمحدث هو المكلم الذي يلقى الله في روعه الصواب يحدثه به الملك عن الله.

"Müslim Aişədən belə nəql etmişdir: Allah Rəsulu (sallallahu əleyhi [və alihi] və səlləm) buyurdu: "Keçmiş ümmətlər arasında mühəddəs şəxslər olmuşdur. Əgər ümmətim arasında onlardan biri olarsa, həmin şəxs Ömər olar".

Bu hədis Əhmədin "Müsnəd" kitabında və Tirmizinin "Sünən" kitabında Əbu Hüreyrədən nəql edilmişdir. Mühəddəs danışılan şəxs deməkdir. Allah onun ağlına doğru olanı salır, mələk doğru olanı Allah tərəfindən ona deyir".[104]

Şəmsəddin əd-Diməşqi demişdir:

الوجه التاسع والعشرون ما رواه مسلم في صحيحه من حديث عائشة رضى الله عنها قالت قال رسول الله صلى الله عليه وسلم قد كان فيمن خلا من الأمم أناس محدّثون فإن يكن في أمتي أحد فهو عمر، المسند والترمذي وغيرهما من حديث أبي هريرة، والمحدّث هو المكلّم الذي يلقي الله في روعه الصواب يحدّثه به الملك عن الله.

---

[103] "Ən-Nihayə fi-ğəribil-əsər", c.1, səh.337-338. Buna bənzər başqa bir sözü Zubeydi "Tacul-ərus"da demişdir (c.1, səh.612).

[104] "Məbhəsul-cihad vəl-xilaf", səh.27.

“İyirmi yeddinci məsələ: Müslim öz “Səhih”ində Aişədən belə nəql etmişdir: “Keçmiş ümmətlər arasında mühəddəs şəxslər olmuşdur. Əgər mənim ümmətim arasında onlardan biri olarsa, həmin şəxs Ömər olar”.

“Müsnəd”də, “Sünənut-Tirmizi”də və digər kitablarda bu hədis Əbu Hüreyrədən nəql olunmuşdur. Mühəddəs danışılan şəxs deməkdir. Allah onun ağlına doğru olanı salır, mələk doğru olanı Allah tərəfindən ona deyir”.[105]

“Səhihul-Buxari”nin şərhçiləri, məsələn, Qəstəlani “İrşadus-sari” kitabında demişdir ki, Allah Rəsuluna (sallallahu əleyhi və alihi və səlləm) nisbət verilən “*əgər mənim ümmətim arasında onlardan biri olarsa, həmin şəxs Ömər olar*” – sözü Ömərin mühəddəs olmasını inkar etmir, əksinə, təsdiq edir! Qəstəlani demişdir:

ليس قوله: «فان يكن» للترديد بل للتأكيد كقولك.

“Peyğəmbərin “əgər mənim ümmətim arasında...” – sözü inkar mənasında deyil, təsdiq mənasındadır”.[106]

Onlar hədisi təsdiq edərək mələklərin Bəni-İsraildən olan bir dəstə şəxslə danışmasını qəbul edir, habelə Ömər də belə olduğunu, mələklərin onunla danışdığını deyirlər.

Həmçinin, belə rəvayət edirlər ki, Allah-taala bir nəfərin yanına mələk göndərmiş, həmin mələyə yanına gedəcəyi şəxsə Allahın onu sevdiyini çatdırmasını əmr etmişdir. “Səhihu-Müslim”də Əbu Hüreyrə Peyğəmbərdən (sallallahu əleyhi və alihi və səlləm) belə nəql etmişdir:

أن رجلاً زار أخاً له في قرية أخرى، فأرصد الله له على مدرجته ملكاً، فلما أتى عليه قال: أين تريد؟ قال: أريد أخاً لي في هذه القرية، قال: هل لك عليه من نعمة تربها؟ قال: لا غير أنى أحببته في الله عزّ وجل، قال: فإني رسول الله إليك بأن الله قد أحبك كما أحببته فيه.

“Bir nəfər başqa bir kənddə olan bir qardaşını ziyarətə getdi. Allah onun yolunun üstündə bir mələk əyləşdirdi. Ziyarətə gedən şəxs mələyin yanından keçəndə mələk ona dedi: “Hara gedirsən?”

Dedi: “Bu kənddə olan bir qardaşın yanına gedirəm”.

Mələk ona dedi: “Sənin onun yanında görəcəyin bir iş var?” [107]

Dedi: “Xeyr. Lakin mən onu Allaha görə sevirəm”.

---

105 “İlamul-muvaqqiin”, c.4, səh.141.

106 “İrşadus-sari”, c.8, səh.179.

107 Hər hansı bir işə görə onun yanına gedirsən? [Müt.]

Mələk dedi: "Mən Allahın sənə göndərdiyi bir elçiyəm. (Gəlmişəm sənə deyim ki,) sən o şəxsi Allaha görə sevdiyin kimi Allah da səni sevmişdir".[108]

Həmçinin onlar mələklərin bəzi səhabələrə salam verdiyini nəql etmişlər. Belə rəvayətlərdən biri Müslimin İmran ibn Həsindən nəql etdiyi aşağıdakı rəvayətdir:

وقد كان يسلّم عليّ حتى اكتويت فَتُرِكْتُ، ثم تركت الكي فعاد.

"Mənə salam verilirdi. Sonra özümü dağladım. Bundan sonra salam kəsildi. Sonra dağlamağı tərk etdim, yenidən salam verildi".[109]

Nəvəvi İbn Həsinin sözünü şərh edərək demişdir:

ومعنى الحديث أن عمران بن الحصين رضي الله عنه كانت به بواسير فكان يصبر على المهمات وكانت الملائكة تسلم عليه فاكتوى فانقطع سلامهم عليه ثم ترك الكي فعاد سلامهم عليه.

"Hədisin mənası budur ki, İmran ibn Həsinin babasili var imiş. Lakin o buna səbir edir, Mələklər də ona salam verirlərmiş. Lakin, sonra o özünü dağlayır, bundan sonra mələklərin salamları kəsilir. Sonra dağlamanı tərk edir və yenidən mələklər ona salam verirlər".[110]

Həmçinin, onlar mələklərin Hüzeyfə ibn Yəmana Allaha həmd etmək mövzusunda dua öyrətdiklərini nəql etmişlər. Əhmədin "Müsnəd" kitabında belə nəql edilmişdir:

أنّه أتى النبي صلى الله عليه وسلم فقال: بينما أنا أصلي إذ سمعت متكلماً يقول اللهم لك الحمد كله، ولك الملك كله، بيدك الخير كله، إليك يرجع الأمر كله علانيته وسرّه، فأهل أن تحمد إنك على كل شيء قدير، اللهم اغفر لي جميع ما مضى من ذنبي واعصمني فيما بقي من عمري، وارزقني عملاً زاكياً ترضى به عني، فقال النبي صلى الله عليه وسلم: ذاك ملك يعلمك تحميد ربك.

"Hüzeyfə Allah Rəsulunun *(sallallahu əleyhi [və alihi] və səlləm)* yanına gəlib dedi: "Mən namaz qıldığım əsnada bir nəfərin belə dediyini eşitdim: "İlahi, bütün həmd Sənə məxsusdur. Bütün mülk Sənə məxsusdur. Bütün xeyir Sənin əlindədir. Bütün işlər aşkarı və gizlisi ilə birlikdə Sənə qayıdır. Sən həmd olunmağa layiqsən. Sən hər şeyə qadirsən. İlahi, mənim bütün keçmiş günahlarımı bağışla. Məni gələcək həyatımda günahdan qoru. Mənə pak

---

108 "Səhihu-Müslim", c.4, səh.1988, №2567; "Səhihu-İbn Hibban", c.2, səh.331, №572; həmçinin, c.2, səh.337, №576; "Müsnədu-Əhməd", c.2, səh.408, №9280; Şüeyb əl-Arnaut demişdir: "İsnadı Müslimin şərtinə əsasən səhihdir", həmçinin c.2, səh.462, №9959, əl-Arnaut demişdir: "İsnadı səhihdir".

109 "Səhihu-Müslim", c.2, səh.899, №1226.

110 "Şərhun-Nəvəvi əla səhihi-Müslim", c.8, səh.206.

bir əməl nəsib et ki, onunla məndən razı qalasan." Peyğəmbər *(sallallahu əleyhi [və alihi] və səlləm)* buyurdu: "O, bir mələk idi. Sənə Rəbbinə həmd etməyin qaydasını öyrədirmiş".[111]

Əhli-sünnənin nəql etdiyi bu hədislər sübut edir ki,[112] mələklər peyğəmbər olmayan bir sıra şəxslərlə danışmışlar. Çünki, mələklərin danışması ilə peyğəmbər olmaq arasında zəruri bağlılıq yoxdur.

Peyğəmbərliyin Allah Rəsulunun *(sallallahu əleyhi və alihi və səlləm)* peyğəmbərliyi ilə sona çatdığına etiqad bəsləmək on iki imam şiələrinin zəruri etiqad prinsiplərindəndir. Şiələrin hədisləri, həmçinin şiə alimlərinin öz əqidələrinin bəyanı barədə, eləcə də həzrət Muhəmmədin *(sallallahu əleyhi və alihi və səlləm)* peyğəmbərliyi barədə yazdıqları kitablar həzrət Muhəmmədin *(sallallahu əleyhi və alihi və səlləm)* sonuncu peyğəmbər olduğuna və ondan sonra bir peyğəmbər olmadığına şahidlik edir. Onlar bu əqidə üzərində icma və ittifaq etmiş, onu yekdilliklə qəbul etmişlər. Onların nə alimləri, nə də savadsızları içərisində peyğəmbərliyin sona çatmadığını iddia edib Muhəmməd peyğəmbərdən sonra başqa bir şəxsin peyğəmbər olduğuna etiqad bəsləyən birisi yoxdur.

---

111 "Müsnədu-Əhməd", c.5, səh.295, №23403.

112 Bu hədislərə Albaninin "Silsilətul-əhadisis-səhihə" kitabında (c.7, səh.373) qeyd etdiyi aşağıdakı mötəbər rəvayəti də əlavə edə bilərik:
İbn Abbasdan belə nəql edilmişdir: Allah Rəsulu *(sallallahu əleyhi [və alihi] və səlləm)* ənsardan olan bir nəfərin ziyarətinə getdi. Onun mənzilinə yaxınlaşdıqda həmin şəxsin içəridə *(kiminləsə)* danışdığını eşitdi. Ondan izn istəyib içəriyə daxil olduqda heç kəsi görmədi. Allah Rəsulu *(sallallahu əleyhi [və alihi] və səlləm)* ona dedi: "Sənin başqa bir nəfərlə danışdığını eşitdim." O şəxs dedi: "Ey Allahın Rəsulu, məndə olan qızdırmaya görə camaatın mənim barəmdə dediyi sözlərdən kədərlənib evimə çəkildim. Bu vaxt içəri bir nəfər daxil oldu ki, sən istisna olmaqla, onun kimi xoşünsiyyət və xoşsözlü birisini görməmişəm!" Peyğəmbər buyurdu: "O, Cəbraildir *(əleyhissəlam)*. Sizin içərisizdə bir sıra şəxslər vardır ki, onlardan biri Allaha and içərsə, onu yaxşılıqla tamamlayar". [Müt.]

## İmamların *(əleyhimussəlam)* elminin geniş (və əhatəli) olması

İmamların *(əleyhimussəlam)* Peyğəmbərin *(sallallahu əleyhi və alihi və səlləm)* elmini irs almaları barədə dəlilləri daha öncə qeyd etdik. Hədislər o Həzrətin *(sallallahu əleyhi və alihi və səlləm)* elminin genişliyi və əhatə dairəsinə də işarə etmişdir. Hədislər göstərir ki, Peyğəmbər *(sallallahu əleyhi və alihi və səlləm)* öncəki peyğəmbərlərə verilməyən elmlərə sahib olmaqla yanaşı, keçmiş peyğəmbərlərin bildiyi elm və həqiqətlərdən də agah olmuşdur. Pak imamlar *(əleyhimussəlam)* da o Həzrətin *(sallallahu əleyhi və alihi və səlləm)* elmini irs apardıqlarına görə, onların elmlərinin genişliyi həzrət Peyğəmbərin elminin genişliyi qədərdir.

Allah Rəsulu *(sallallahu əleyhi və alihi və səlləm)* daha öncə baş vermiş və Qiyamətədək baş verəcək işlərdən xəbərdar olmuşdur. Buna həm şiə, həm də sünnilərin nəql etdiyi hədislər dəlalət edir. Sünnilər tərəfindən nəql olunan hədislərə misal olaraq Müslimin öz "Səhih"ində və digər hafizlərin də öz kitablarında Hüzeyfədən nəql etdikləri hədisi göstərə bilərik:

قام فينا رسول الله صلى الله عليه وسلم مقاماً ما ترك شيئاً يكون في مقامه ذلك إلى قيام الساعة إلاّ حدّث به، حفظه من حفظه، ونسيه من نسيه، قد علمه أصحابي هؤلاء، وأنّه ليكون منه الشيء قد نسيته فأراه فأذكره كما يذكر الرجل وجه الرجل إذا غاب عنه ثم إذا رآه عرفه.

"Bir gün Allah Rəsulu (sallallahu əleyhi [və alihi] və səlləm) bizim üçün (xütbə edərək) həmin gündən ta Qiyamət gününədək baş verəcək bütün hadisələri danışdı. Yadda saxlayanlar saxladı, unudanlar unutdu. Onu (həmin deyilənləri) mənim bu yoldaşlarım da bildilər. Bəzən həmin deyilən hadisələrdən unutduğum birisi baş verir. Mən onu gördüyüm zaman xatırlayıram. Necə ki, bir şəxs kimisə üzdən tanıyır, lakin sonra həmin şəxs (uzun müddət) görünmür. (Nəticədə onun üzünü unudur), sonra isə o adamı görüncə tanıyır".[113]

Müslim və başqaları Əmr ibn Əxtəbdən belə nəql etmişlər:

صلى بنا رسول الله صلى الله عليه وسلم الفجر وصعد المنبر فخطبنا حتى حضرت الظهر فنزل فصلى ثم صعد المنبر فخطبنا حتى حضرت العصر ثم نزل فصلى ثم صعد المنبر فخطبنا حتى غربت الشمس فأخبرنا بما كان وبما هو كائن فأعلمنا أحفظنا.

113 "Səhihu-Müslim", c.4, səh.2216, №2891; "əl-Müstədrək ələs-səhiheyn", c.4, səh.518, №8454; "Müsnədu-Əhməd", c.5, səh.388, №23339; "Müsnəduş-şamiyyin", c.4, səh.130, №2917; "Fəthul-Bari", c.6, səh.607; "Tarixu-Diməşq", c.8, səh.351 və c.12, səh.266; "əs-Sünənul-varidətu fil-fitən", c.1, səh.233; "əl-Fitən", c.1, səh.28, №3; "Siyəru-əlamin-nübəla", c.2, səh.365; "Təhzibül-kəmal", c.5, səh.501.

“Allah Rəsulu (sallallahu əleyhi [və alihi] və səlləm) bizə sübh namazını qıldırdı. Sonra minbərə çıxıb bizim üçün zöhr namazına qədər xütbə etdi. Sonra Peyğəmbər (sallallahu əleyhi [və alihi] və səlləm) minbərdən enib zöhr namazını qıldırdı. Daha sonra isə minbərə çıxıb bizim üçün əsr namazına qədər xütbə söylədi. Ardınca Peyğəmbər minbərdən enib əsr namazını qıldırdı. Sonra minbərə çıxıb bizim üçün günəş batana qədər xütbə etdi. (Bu müddət ərzində) Peyğəmbər bizə keçmişdə baş vermiş və gələcəkdə baş verəcək şeyləri xəbər verdi. Bizim aramızda (həmin şeyləri) ən çox bilən şəxs ən çox yadda saxlayan şəxsdir”.[114]

Tirmizi özünün səhih toplusu olan “Sünənut-Tirmizi” kitabında Əbu Səid əl-Xudridən öz sənədi belə nəql etmişdir:

صلّى بنا رسول الله صلى الله عليه وسلم يوماً صلاة العصر بنهار ثم قام خطيباً فلم يدع شيئاً يكون إلى قيام الساعة إلاّ أخبرنا به، حفظه من حفظه ونسيه من نسيه...

“Bir gün Allah Rəsulu (sallallahu əleyhi [və alihi] və səlləm) gündüz vaxtı[115] bizə əsr namazını qıldırdı. Sonra qalxıb xütbə etdi və qiyamət gününədək baş verəcək nə varsa hamısını bizə xəbər verdi. Yadda saxlayanlar saxladılar, unudanlar unutdular...”

Tirmizi demişdir:

وفي الباب عن حذيفة وأبي مريم وأبي زيد بن أخطب والمغيرة بن شعبة وذكروا أن النبي صلى الله عليه وسلم حدّثهم بما كان وبما هو كائن إلى أن تقوم الساعة، وهذا حديث حسن صحيح.

“Bu babda, həmçinin, Hüzeyfə, Əbu Məryəm, Əbu Zeyd ibn Əxtəb və Muğeyrə ibn Şubədən Peyğəmbərin (sallallahu əleyhi [və alihi] və səlləm) daha öncə baş vermiş və Qiyamətədək baş verəcək şeyləri səhabələrə danışdığı nəql edilmişdir. Bu, həsən və səhih hədisdir”.[116]

Heysəminin “Məcməuz-zəvaid” kitabında belə nəql edilmişdir:

وعن زيد بن أرقم قال: أمر رسول الله صلى الله عليه وسلم بالشجرات فقم ما تحتها ورش، ثم خطبنا فو الله ما من شيء يكون إلى يوم الساعة إلاّ قد أخبرنا به يومئذ، ثم قال: يا أيها الناس من أولى بكم من أنفسكم؟ قلنا الله ورسوله

---

114 “Səhihu-Müslim”, c.4, səh.2217, №2891; “Səhihu-İbn Hibban”, c.15, səh.5, №6636; “Sünənu-Əbu Davud”, c.4, səh.94, №4240 və s.

115 Bəlkə də zöhrlə əsr namazının birləşdirilməsinə işarə edilmişdir. Yaxud da əsr namazının qısa şəkildə qılınmasına işarə edilmişdir. Muhəmməd ibn Əbdür-Rəhaman əl-Mübarəkpuri bu sözün izahında demişdir: “Bu sözdə Allah Rəsulunun *(sallallahu əleyhi [və alihi] və səlləm)* həmin gün əsr namazını tez (tələsik) qıldırmasına işarə edilmişdir.” (“Şərhu-tuhfətil-əhvəzi”, 2191-ci hədisin şərhi) [Müt.]

116 “Sünənut-Tirmizi”, c.4, səh.483, №2191.

أولى بنا من أنفسنا، قال فمن كنت مولاه فهذا مولاه، يعني علياً، ثم أخذ بيده فبسطها ثم قال: اللهم وال من والاه وعاد من عاداه.

"Zeyd ibn Ərqəmdən belə nəql edilmişdir: Allah Rəsulu (sallallahu əleyhi [və alihi] və səlləm) ağacların altının tikanlardan təmizlənməsi və (toz-torpaqları yatsın deyə) altlarına su səpilməsini əmr etdi. Sonra bizə xütbə söylədi. Allaha and olsun ki, Qiyamət gününədək baş verəcək nə varsa, hamısını həmin gün bizə xəbər verdi. Sonra dedi: "Ay camaat, sizə sizin özünüzdən daha üstün olan kimdir?"

Dedik: "Allah və Onun Rəsulu bizə özümüzdən daha üstündür".

Buyurdu: "Mən kimin mövlasıyamsa (kimə onun özündən daha üstünəmsə), bu da – yəni, Əli də – onun mövlasıdır (ona onun özündən daha üstündür)." Sonra onun əlini tutub qaldırdı və dedi: "İlahi, ona dost olana dost ol, ona düşmən olana düşmən ol".

Ardınca Heysəmi demişdir:

قلت: روى الترمذي منه من كنت مولاه فعلي مولاه فقط، رواه الطبراني وفيه حبيب بن خلاد الأنصاري ولم أعرفه وبقية رجاله ثقات.

"Deyirəm: "Tirmizi bu hədisdən, təkcə "mən kimin mövlasıyamsa, Əli də onun mövlasıdır" – hissəsini nəql etmişdir. Bunu Təbərani də nəql etmişdir. Hədisin sənədində Həbib ibn Xəllad əl-Ənsari vardır ki, onu tanımıram. Yerdə qalan ravilər siqədirlər.[117]"[118]

**Deyirəm:** Heysəminin tanımadığı Həbib ibn Xəllad əl-Ənsari – Həbib ibn Zeyd ibn Xəllad əl-Ənsaridir və siqədir. İbn Həcər "Təqribut-təhzib" kitabında demişdir:

حبيب بن زيد بن خلاّد الأنصاري المدني وقد ينسب إلى جده ثقة من السابعة.

"Həbib ibn Zeyd ibn Xəllad əl-Ənsari əl-Mədəni, bəzən babasına nisbət edilir.[119] Yeddinci təbəqədən olan siqə şəxsdir".[120]

Şiə təriqinə[121] gəlincə, Əllamə Səffar səhih sənədlə İmam Sadiqdən *(əleyhissəlam)* belə nəql etmişdir:

---

[117] Siqə: güvənilir və etimadlı şəxs deməkdir. [Müt.]

[118] "Məcməüz-zəvaid", c.9, səh.105.

[119] Yəni, Həbib ibn Zeyd ibn Xəllad deyil, Həbib ibn Xəllad adlanır. [Müt.]

[120] "Təqribut-təhzib", səh.150.

[121] Təriq: hədisin sənədi, "filankəs filankəsdən, həmin şəxs filankəsdən, o da filankəsdən... nəql etdi" şəklində olan hissə. [Müt.]

سئل علي عليه السلام عن علم النبي صلى الله عليه وآله فقال: علم النبي علم جميع النبيين وعلم ما كان وعلم ما هو كائن إلى قيام الساعة، ثم قال: والذي نفسي بيده إني لأعلم علم النبي صلى الله عليه وآله وعلم ما كان وما هو كائن فيما بيني وبين قيام الساعة.

"Əlidən (əleyhissəlam) Peyğəmbərin (sallallahu əleyhi və alihi və səlləm) elmi barədə soruşuldu. Buyurdu: "Peyğəmbər (sallallahu əleyhi və alihi və səlləm) bütün peyğəmbərlərin (əleyhimussəlam) elmlərini bilirdi. O, keçmişdə baş vermiş və qiyamətədək baş verəcək bütün şeyləri bilirdi." Sonra dedi: "And olsun canım onun əlində olan Kəsə! Mən Peyğəmbərin (sallallahu əleyhi və alihi və səlləm) elmini və keçmişdə baş vermiş və bu zamandan ta Qiyamətədək baş verəcək şeyləri bilirəm".[122]

Peyğəmbərin *(sallallahu əleyhi və alihi və səlləm)* elminin genişliyinə, Allahın ona – bəzisini yığcam, bəzisini isə geniş şəkildə olmaqla – bir çox həqiqətləri öyrətdiyinə dəlalət edən rəvayətlərdən biri Müslimin öz "Səhih"ində Cabirdən nəql etdiyi bu rəvayətdir:

انكسفت الشمس في عهد رسول الله صلى الله عليه وسلم يوم مات إبراهيم ابن رسول الله صلى الله عليه وسلم، فقال الناس إنما انكسفت لموت إبراهيم، فقام النبي صلى الله عليه وسلم فصلى بالناس ست ركعات بأربع سجدات، بدأ فكبر ثم قرأ فأطال القراءة، ثم ركع نحواً مما قام، ثم رفع رأسه من الركوع، فقرأ قراءةً دون القراءة الأولى، ثم ركع نحواً مما قام، ثم رفع رأسه من الركوع فقرأ قراءةً دون القراءة الثانية، ثم ركع نحواً مما قام ثم رفع رأسه من الركوع ثم انحدر بالسجود فسجد سجدتين، ثم قام فركع أيضاً ثلاث ركعات ليس فيها ركعة إلاّ التي قبلها أطول من التي بعدها، وركوعه نحواً من سجوده، ثم تأخر وتأخرت الصفوف خلفه حتى انتهينا، وقال أبو بكر حتى انتهى إلى النساء، ثم تقدم وتقدم الناس معه حتى قام في مقامه فانصرف حين انصرف وقد آضت الشمس، فقال يا أيها الناس إنما الشمس والقمر آيتان من آيات الله وإنهما لا ينكسفان لموت أحد من الناس، وقال أبو بكر لموت بشر فإذا رأيتم شيئاً من ذلك فصلوا حتى تنجلي، ما من شيء توعدونه إلاّ قد رأيته في صلاتي هذه، لقد جيء بالنار وذلكم حين رأيتموني تأخرت مخافة أن يصيبني من لفحها، وحتى رأيت فيها صاحب المحجن يجر قصبه في النار، كان يسرق الحاج بمحجنه فإن فطن له قال إنما تعلق بمحجني وإن غفل عنه ذهب به، وحتى رأيت فيها صاحبة الهرة التي ربطتها فلم تطعمها ولم تدعها تأكل من خشاش الأرض حتى ماتت جوعاً، ثم جيء بالجنة وذلكم حين رأيتموني تقدمت حتى قمت في مقامي، ولقد مددت يدي وأنا أريد أن أتناول من ثمرها لتنظروا إليه، ثم بدا لي أن لا أفعل، فما من شيء توعدونه إلاّ قد رأيته في صلاتي هذه.

"Allah Rəsulunun (sallallahu əleyhi [və alihi] və səlləm) zamanında, oğlu İbrahim vəfat etdiyi gün günəş tutuldu. Camaat, "Günəş, məhz İbrahimin ölümünə görə tutuldu", - dedi. Peyğəmbər (sallallahu əleyhi [və alihi] və səlləm) qalxıb camaata dörd səcdəli, altı rəkətli namaz qıldırdı. Namaza başlayıb təkbir dedi, sonra

---

[122] "Bəsairud-dərəcat", səh.131.

qiraətə başladı və qiraətini uzatdı... Ardınca dedi: "Ey camaat, günəş də, ay da Allahın nişanələrindəndir. Onlar kiminsə ölümünə görə tutulmazlar. Əgər belə bir şeyin baş verdiyini görsəniz, (günəş və ya ay) açılana qədər namaz qılın. Sizə vəd edilən nə varsa, mən onları bu namazımda gördüm. Cəhənnəmi (qarşıma) gətirdilər. Bu o zaman idi ki, siz mənim (namaz əsnasında) bir qədər geri getdiyimi gördünüz. (Ona görə geri getdim ki,) onun odundan bir şey mənə dəyməsin... Sonra Cənnəti (qarşıma) gətirdilər. Bu o zaman idi ki, siz mənim bir qədər irəli gedib (əvvəlki) yerimdə durduğumu gördünüz. Mən siz baxasınız deyə Cənnətin meyvələrindən dərmək üçün əlimi uzatdım, lakin sonra fikrimdən daşındım. Sizə vəd edilən hər nə varsa, hamısını bu namazımda gördüm".[123]

Həmçinin, İbn Xüzeymə öz "Səhih"ində Sələbə ibn İbad əl-Əbdidən nəql etmişdir ki, Sələbə Səmurə ibn Cündəbin belə dediyini eşitmişdir:

أنه شهد خطبة يوماً لسمرة بن جندب، فذكر في خطبته قال سمرة بن جندب: بينا أنا يوماً وغلام من الأنصار نرمي عرضاً لنا على عهد رسول الله صلى الله عليه وسلم، حتى إذا كانت الشمس قيد رمحين أوثلاثة في غير الناظرين في الأفق اسودت حتى كأنها تنومه، فقال أحدنا لصاحبه انطلق بنا إلى المسجد فو الله ليحدثن شأن هذه الشمس لرسول الله صلى الله عليه وسلم في أمته حدثاً، فدفعنا إلى المسجد فإذا هو بارز فوافقنا رسول الله صلى الله عليه وسلم حين خرج إلى الناس، قال فاستقدم فصلى بنا كأطول ما قام بنا في صلاة قط، لا يسمع له صوت ثم ركع بنا كأطول ما ركع بنا في صلاة قط ولا يسمع له صوت، ثم سجد بنا كأطول ما سجد بنا في صلاة قط لا يسمع له صوت، قال ثم فعل في الركعة الثانية مثل ذلك، قال فوافق تجلي الشمس جلوسه في الركعة الثانية، قال فسلم فحمد الله وأثنى عليه وشهد أنه لا إله إلا الله وشهد أنه عبده ورسوله، ثم قال أيها الناس إنما أنا بشر رسول الله فأذكركم بالله إن كنتم تعلمون أني قصرت عن شيء من تبليغ رسالات ربي لما أجبتموني حتى أبلغ رسالات ربي كما ينبغي لها أن تبلغ، وإن كنتم تعلمون أني قد بلغت رسالات ربي لما أخبرتموني، قال فقام الناس فقالوا شهدنا أنك قد بلغت رسالات ربك ونصحت لأمتك وقضيت الذي عليك، قال ثم سكتوا، قال قال رسول الله صلى الله عليه وسلم أما بعد فإن رجالاً يزعمون أن كسوف هذه الشمس وكسوف هذا القمر وزوال هذه النجوم عن مطالعها لموت رجال عظماء من أهل الأرض، وأنهم كذبوا ولكنها آيات من آيات الله يفتن بها عباده، لينظر من يحدث منهم توبة، والله لقد رأيت منذ قمت أصلي ما أنتم لاقون في دنياكم وآخرتكم، وإنه والله لا تقوم الساعة حتى يخرج ثلاثون كذاباً آخرهم الأعور.

"...Sonra Allah Rəsulu (sallallahu əleyhi [və alihi] və səlləm) buyurdu: "Bəzi şəxslər iddia edirlər ki, bu günəşin tutulması, bu ayın tutulması və bu ulduzların öz yerlərindən itmələri yer üzündəki bəzi böyük şəxslərin ölümünə görədir. Onlar yalan demişlər. Bütün bunlar Allahın nişanələrindən biridir. Allah bunlarla bəndələri imtahana çəkir ki, onlardan kimin öz tövbəsini

[123] "Səhihu-Müslim", c.2, səh.623.

yeniləyəcəyini görsün. Allaha and olsun ki, qalxıb namaz qıldığım andan etibarən sizin dünya və axirətdə qarşılaşacağınız bütün şeyləri gördüm. Allaha and olsun ki, qiyamət qopmamışdan (qabaq) otuz yalançı ortaya çıxacaq, onların sonuncusu taygöz (Dəccal) olacaq".[124]

Tirmizinin "Sünən" kitabında nəql etdiyi bir rəvayətdə deyilir ki, Allah Rəsulu *(sallallahu əleyhi və alihi və səlləm)* cənnətlik və cəhənnəmlik şəxslərin adlarını, atalarının adlarını və qəbilələrinin adlarını bilirmiş.

Tirmizi Abdullah ibn Əmr ibn əl-Asdan öz sənədi ilə belə nəql etmişdir:

خرج علينا رسول الله صلى الله عليه وسلم وفي يده كتابان فقال: أتدرون ما هذان الكتابان؟ فقلنا: لا يا رسول الله إلاّ أن تخبرنا، فقال للّذي في يده اليمنى هذا كتابٌ من ربّ العالمين فيه أسماء أهل الجنّة وأسماء آبائهم وقبائلهم، ثمّ أجمل على آخرهم فلا يزاد فيهم ولا ينقص منهم أبداً، ثمّ قال للّذي في شماله هذا كتابٌ من ربّ العالمين فيه أسماء أهل النّار وأسماء آبائهم وقبائلهم، ثمّ أجمل على آخرهم فلا يزاد فيهم ولا ينقص منهم أبداً، فقال أصحابه ففيم العمل يا رسول الله إن كان أمرٌ قد فرغ منه؟ فقال: سدّدوا وقاربوا، فإن صاحب الجنّة يختم له بعمل أهل الجنّة وإن عمل أيّ عمل، وإنّ صاحب النّار يختم له بعمل أهل النّار وإن عمل أيّ عمل، ثمّ قال رسول الله صلى الله عليه وسلم بيديه فنبذهما، ثمّ قال فرغ ربّكم من العباد، فريقٌ في الجنّة وفريقٌ في السّعير.

"Allah Rəsulu (sallallahu əleyhi [və alihi] və səlləm) əlində iki kitabla birgə bizim yanımıza gəldi və dedi: "Bilirsiniz bu kitablar nədir?"

Dedik: "Xeyr, ey Allahın Rəsulu, amma sən bizə desən bilərik".

Bundan sonra Peyğəmbər (sallallahu əleyhi [və alihi] və səlləm) sağ əlindəki kitab barəsində buyurdu: "Bu, aləmlərin Rəbbi tərəfindən olan bir kitabdır. Burada Cənnət əhlinin adları, onların atalarının və qəbilələrinin adları vardır." Sonra Peyğəmbər (sallallahu əleyhi [və alihi] və səlləm) onların sonuncuları barədə qısa məlumat verdi.[125] Onların sayları nə artacaq, nə azalacaq. Sonra sol əlindəki kitab barəsində buyurdu: "Bu (da), aləmlərin Rəbbi tərəfindən olan bir kitabdır. Burada Cəhənnəm əhlinin adları, onların atalarının və qəbilələrinin adları vardır." Sonra Peyğəmbər (sallallahu əleyhi [və alihi] və səlləm) onların sonuncuları barədə qısa məlumat verdi. Onların sayları nə artacaq, nə də azalacaq..."

Tirmizi bu hədisi qeyd etdikdən sonra demişdir:

هذا حديث حسن غريب صحيح.

---

[124] "Səhihu-İbn Xuzeymə", c.2, səh.325, №1398.

[125] Yaxud: onların sonuncularınadək qısa şəkildə məlumat verdi. Birinci ehtimal daha dəqiq görünür. [Müt.]

“Bu, həsən, qərib və səhih hədisdir”.[126]

“Səhihul-Buxari” kitabında Tariq ibn Şihabdan belə nəql edilmişdir:

قام فينا رسول الله صلى الله عليه وسلم مقاماً، فأخبرنا عن بدء الخلق، حتى دخل أهل الجنة منازلهم وأهل النار منازلهم، حفظ ذلك من حفظه ونسيه من نسيه.

“Ömərin belə dediyini eşitdim: Ömərin belə dediyini eşitdim: (Bir gün) Allah Rəsulu (sallallahu əleyhi [və alihi] və səlləm) bizim üçün uzun bir müddət xütbə edərək yaradılışın əvvəlindən cənnət əhlinin cənnətdəki, cəhənnəm əhlinin də cəhənnəmdəki yerlərinə daxil olmalarına qədər (hər şeydən yaxud hər şeyi) danışdı. Bunu yadda saxlayanlar saxladılar, unudanlar unutdular”.[127]

Hətta dəlillər sübuta yetirmişdir ki, Allah Rəsuluna *(sallallahu əleyhi və alihi və səlləm)* bütün elmlərin açarları verilmişdir. Əhli-sünnə alimləri Peyğəmbərin *(sallallahu əleyhi və alihi və səlləm)* belə dediyini nəql etmişlər:

أوتيت مفاتيح كل شيء إلاّ الخمس {إِنَّ اللهَ عِنْدَهُ عِلْمُ السَّاعَةِ وَيُنَزِّلُ الْغَيْثَ وَيَعْلَمُ مَا فِي الْأَرْحَامِ وَمَا تَدْرِي نَفْسٌ مَاذَا تَكْسِبُ غَداً وَمَا تَدْرِي نَفْسٌ بِأَيِّ أَرْضٍ تَمُوتُ إِنَّ اللهَ عَلِيمٌ خَبِيرٌ}.

“Beş şeydən başqa bütün şeylərin açarları mənə verilmişdir: “**Həqiqətən, o saatı (Qiyamətin qopacağı vaxtı) ancaq Allah bilir. Yağışı göydən O yağdırır, bətnlərdə olanı O bilir. Heç kəs səhər nə kəsb edəcəyini (savab, yaxud günah qazanacağını), heç kəs harada öləcəyini bilməz. Allah isə, şübhəsiz ki, (hər şeyi) biləndir, (hər şeydən) xəbərdardır!**[128]”[129]

Süyuti “əl-Xəsaisul-kubra” kitabında demişdir:

وأخرج أحمد والطبراني بسند صحيح عن ابن عمر عن النبي صلى الله عليه وسلم قال: أوتيت مفاتيح كل شيء إلاّ الخمس {إِنَّ اللهَ عِنْدَهُ عِلْمُ السَّاعَةِ ... الآية}.

“Əhməd və Təbərani səhih sənədlə İbn Ömərdən, o da Peyğəmbərdən (sallallahu əleyhi [və alihi] və səlləm) nəql etmişdir:

---

[126] “Sünənut-Tirmizi”, c.4, səh.449, № 2141; Əlbani “Səhihul-camiis-səğir və ziyadətih” kitabında bu hədisi səhih hesab etmişdir: c.1, səh.79-80, №88; Əbu Nəim İsfahani “Hilyətul-əvliya”, c.3, səh.303; İbn Əbu Asim “Sünnə”, c.1, səh.154, №348; Əbül-Qasim İsmayıl ibn Muhəmməd ibn Fəzl ət-Teymi əl-İsfahani “əl-Hüccə fi bəyanil-məhəccə”, c.2, səh.33.

[127] “Səhihul-Buxari”, c.3, səh.1166, №3020.

[128] “Loğman” surəsi, 34-cü ayə.

[129] “əd-Durrul-mənsur”, c.6, səh.532; “Təfsiru-İbn Kəsir”, c.3, səh.544; “Ruhul-məani”, c.21, səh.111; “əl-Mucəmul-kəbir”, c.12, səh.360, №13344; “Müsnədu-Əhməd”, c.2, səh.85, №5579; “Məcməüz-zəvaid”, c.8, səh.263; Heysəmi demişdir: “Bunu Əhməd və Əbu Yəla nəql etmişdir. Hər ikisinin raviləri “Səhih”in raviləridir.” “Kənzul-ummal”, c.11, səh.191, № 31999.

Beş şeydən başqa bütün şeylərin açarları mənə verilmişdir: "**Həqiqətən, o saatı (qiyamətin qopacağı vaxtı) ancaq Allah bilir...**"[130]

Başqa bir rəvayətdə Peyğəmbərin *(sallallahu əleyhi və alihi və səlləm)* belə buyurduğunu nəql etmişlər:

وتي نبيكم صلى الله عليه وسلم مفاتيح كل شيء غير الخمس {إِنَّ اللهَ عِنْدَهُ عِلْمُ السَّاعَةِ وَيُنَزِّلُ الْغَيْثَ وَيَعْلَمُ مَا فِي الْأَرْحَامِ وَمَا تَدْرِي نَفْسٌ مَاذَا تَكْسِبُ غَداً وَمَا تَدْرِي نَفْسٌ بِأَيِّ أَرْضٍ تَمُوتُ إِنَّ اللهَ عَلِيمٌ خَبِيرٌ}.

"Sizin Peyğəmbərinizə (sallallahu əleyhi [və alihi] və səlləm) beş şeydən başqa hər bir şeyin açarları verilmişdir: "**Həqiqətən, o saatı (Qiyamətin qopacağı vaxtı) ancaq Allah bilir. Yağışı göydən O yağdırır, bətnlərdə olanı O bilir. Heç kəs səhər nə kəsb edəcəyini (savab, yaxud günah qazanacağını), heç kəs harada öləcəyini bilməz. Allah isə, şübhəsiz ki, (hər şeyi) biləndir, (hər şeydən) xəbərdardır!**"[131].[132]

Hətta bəzi əhli-sünnə alimləri ayədə qeyd olunan beş şeyin elminin də Peyğəmbərə verildiyini iddia etmişlər. Mühəddis Abdullah əl-Ğimari demişdir:

عن ابن عمر رضي الله عنهما عن النبي صلى الله عليه وآله وسلم قال: «أوتيت مفاتيح كل شيء إلاّ الخمس {إِنَّ اللهَ عِنْدَهُ عِلْمُ السَّاعَةِ ... الآية}» رواه أحمد والطبراني بإسناد صحيح، وفي الصحيحين عن حذيفة قال: قام فينا رسول الله صلى الله عليه وآله وسلم مقاماً ما ترك فيه شيئاً إلى قيام الساعة إلاّ ذكره, حفظه من حفظه ونسيه من نسيه وإنه ليكون منه الشيء قد كنت نسيته فأراه فاذكره كما يذكر الرجل وجه الرجل إذا غاب عنه، ثم إذا رآه عرفه.

قوله: «أوتيت مفاتيح كل شيء» أي من العلوم والمعارف وسائر المغيبات.

قال القاضي عياض في الشفا في فصل ما اطلع عليه من الغيوب وما يكون ما نصه: والأحاديث في هذا الباب بحر لا يدرك قعره, ولا ينزف غمره, وهذه المعجزة من جملة معجزاته المعلومة على القطع الواصل إلينا خبرها على التواتر لكثرة رواتها واتفاق معانيها على الاطلاع على الغيب اهـ.

"İbn Ömər Peyğəmbərdən (sallallahu əleyhi [və alihi] və səlləm) belə nəql etmişdir: "Beş şeydən başqa bütün şeylərin açarları mənə verilmişdir: "**Həqiqətən, o saatı (qiyamətin qopacağı vaxtı) ancaq Allah bilir. Yağışı göydən O yağdırır, bətnlərdə olanı O bilir. Heç kəs səhər nə kəsb edəcəyini (savab, yaxud**

---

130 "Əl-Xəsaisul-kübra", c.2, səh.334.

131 "Loğman" surəsi, 34-cü ayə.

132 "Əd-Dürrul-mənsur", c.6, səh.532; "Təfsiru-İbn Kəsir", c.3, səh.455; "Təfsiru-Təbəri", c.21, səh.89; "Müsnədu-Humeydi", c.1, səh.68, №124; "Müsnədu-Əbu Yəla", c.9, səh.86, №5153; "Müsnədu-Əhməd", c.1, səh.386; "Məcməüz-zəvaid", c.8, səh.213; Heysəmi demişdir: "Bunu Əhməd və Əbu Yəla nəql etmişdir, hər ikisinin ravisi "Səhih"in raviləridir."

**günah qazanacağını), heç kəs harada öləcəyini bilməz. Allah isə, şübhəsiz ki, (hər şeyi) biləndir, (hər şeydən) xəbərdardır!**"

Bu rəvayəti Əhməd və Təbərani səhih sənədlə nəql etmişlər. "Səhiheyn"də isə Hüzeyfədən belə nəql olunmuşdur: "Bir gün Allah Rəsulu (sallallahu əleyhi [və alihi] və səlləm) bizim üçün uzun bir xütbə söylədi və həmin gündən Qiyamət gününədək baş verəcək bütün hadisələri danışdı. Yadda saxlayanlar saxladı, unudanlar unutdu. O (deyilənləri) mənim bu yoldaşlarım da bildilər. Bəzən o deyilənlərdən unutduğum birisi baş verir. Mən onu görür və gördüyüm zaman xatırlayıram. Necə ki, bir şəxs kimisə üzdən tanıyır, lakin sonra həmin şəxs (bir müddət) görünmür. (Nəticədə bu şəxs də onun üzünü unudur), sonra o adamı görüncə tanıyır."

Hədisdəki "...bütün şeylərin açarları mənə verilmişdir" – sözünün mənası budur ki, bütün elmlərin, maariflərin və digər qeybi işlərin açarları mənə verilmişdir.

Qazi İyad "əş-Şifa" kitabında "Peyğəmbərin qeybi və gələcəkdə baş verəcək işlərdən bildiyi şeylər"[133] adlı fəsildə demişdir:

"Bu babdakı hədislər sonuna yetişilməyən, bol suyu qurumayan bir dənizdir. Bu möcüzə[134] o Həzrətin qəti şəkildə bilinən, xəbəri bizə təvatür həddində gəlib çatan möcüzələrindəndir. Bu möcüzə (ona görə təvatür həddində gəlib çatmış sayılır ki) onu nəql edən ravilərin sayı çox, (həmin ravilərin nəql etdikləri hədislərin) məzmunları isə Peyğəmbərin qeybi bilməsi üzərində müttəfiqdir". Sitatın sonu.

ثم أورد جملة منها فليراجع.

وأخرج الطبراني عن ابن عمر قال: قال رسول الله صلى الله عليه وآله وسلم: «إن الله قد رفع لي الدنيا فانا انظر إليها وإلى ما هو كائن فيها الى يوم القيامة كانما أنظر إلى كفي هذه.«

وقد أخبر صلى الله عليه وآله وسلم بكثير من أحوال هذا العصر ومخترعاته، وسنطبع رسالة لطيفة في هذا الموضوع بحول الله تعالى.

قوله: «إلاّ الخمس {إِنَّ اللهَ عِنْدَهُ عِلْمُ السَّاعَةِ ... الآية}» وفي صحيح البخاري عن ابن عمر مرفوعاً «مفاتيح الغيب خمس لا يعلمها إلاّ الله: لا يعلم أحد ما يكون في غد إلاّ الله , ولا يعلم أحد ما يكون في الأرحام إلاّ الله , ولا يعلم متى تقوم الساعة إلاّ الله , ولا تدري نفس بأي أرض تموت إلاّ الله , ولا يدري أحد متى يجيء المطر إلاّ الله» ومقتضى هذا أنه لم يكن صلى الله عليه وآله وسلم يعلم الخمس, وإليه ذهب الجمهور, لكن قال الحافظ السيوطي في

---

[133] Yaxud: Peyğəmbərin xəbərdar olduğu qeybi işlər və gələcəkdə baş verəcək işlər. [Müt.]

[134] "Bu möcüzə" dedikdə Peyğəmbərin *(sallallahu əleyhi və alihi və səlləm)* bir sıra qeybi işləri bilməsini nəzərdə tutur. [Müt.]

الخصائص الكبرى: ذهب بعضهم إلى أنه صلى الله عليه وسلم أوتي علم الخمس أيضاً وعلم وقت الساعة والروح وأنه أمر بكتم ذلك. اهـ

Bundan sonra Qazı İyad bu cür hədislərdən bir neçəsini qeyd etmişdir. Maraqlananlar Qazının kitabına müraciət etsinlər.

Həmçinin, Təbərani İbn Ömərdən belə nəql etmişdir: Allah Rəsulu (sallallahu əleyhi [və alihi] və səlləm) buyurdu: "Allah dünyanı mənim üçün elə qaldırıb (qarşıma qoydu) ki, mən ona və Qiyamətədək orada baş verəcək şeylərə bu ovucuma baxdığım kimi baxıram."

Allah Rəsulu (sallallahu əleyhi [və alihi] və səlləm) bu dövrün vəziyyəti və bu dövrdəki ixtiralardan bir çoxu barədə xəbər vermişdir. Allahın yardımı ilə biz bu mövzuda maraqlı bir risalə çap edəcəyik.

Hədisdəki "...beş şeydən başqa: "**Həqiqətən, o saatı (Qiyamətin qopacağı vaxtı) ancaq Allah bilir...**" – ifadəsinin (izahına) gəlincə: "Səhihul-Buxari"də İbn Ömərdən mərfu olaraq belə nəql edilmişdir: "Qeybin açarları beşdir. Onları Allahdan başqa heç kəs bilmir; Allahdan başqa heç kəs sabah nə olacağını bilmir. Allahdan başqa heç kəs bətnlərdə olanı bilmir. Allahdan başqa heç kəs qiyamətin nə vaxt qopacağını bilmir. Heç bir canlı harada öləcəyini bilmir. Bunu yalnız Allah bilir. Allahdan başqa heç kəs yağışın nə vaxt yağacağını bilmir".

Bu cümlədən belə nəticə çıxır ki, Allah Rəsulu (sallallahu əleyhi [və alihi] və səlləm) bu beş şeyi bilmirmiş. Cümhur[135] da bu rəydə olmuşdur. Lakin hafiz əs-Süyuti "əl-Xəsaisul-kubra" kitabında demişdir ki: "Bəzi alimlər bildirmişlər ki, bu beş şeyin elmi də Peyğəmbərə (sallallahu əleyhi [və alihi] və səlləm) verilmiş, qiyamətin nə vaxt baş verəcəyi, ruhun nədən ibarət olduğu (ona açıqlanmışdır). Lakin Peyğəmbərə bunları gizli saxlamaq əmr olunmuşdur". **Sitatın sonu.**

وبه جزم كثير من المتأخرين.

وللإمام منصور البغدادي في هذا الموضوع كتاب اسمه «إقامة شواهد المنقول والمعقول على إحاطة علم نبينا صلى الله عليه وسلم» , وسأل الشيخ أبو العباس أحمد بن عبد الحي الحلبي العلامة المحدث عبد الملك بن محمد التجموعتي قاضي سجلماسة عن هذه المسألة فأجابه برسالة خاصة سماها «ملاك الطلب وجواب أستاذ حلب» جزم فيها بأنه صلى الله عليه وآله وسلم كان يعلم الخمس.

وللشيخ أحمد رضا علي خان البريلوي الهندي في هذا الموضوع ثلاث رسائل: «ملء الجيب بعلوم الغيب» و «اللؤلؤ المكنون في علم البشير ما كان وما يكون» و «إنباء المصطفى بما أسر وأخفى»، وقال العلامة أبو عبد الله محمد الحبيب بن عبد القادر السجلماسي الحسني في شرح منظومة الأسماء الحسنى للهلالي: يجب علينا أن نعتقد أنه

135 Alimlərin əksəriyyəti. [Müt.]

صلى الله عليه وسلم أنه لم يخرج من الدنيا حتى حصل له العلم بجميع المعلومات للحديث الصحيح: أوتيت علم كل شيء وتجلى لي كل شيء , وما ورد مما يخالفه منسوخ بهذا وبه تظهر مزيته وفضيلته العلمية على سائر الأنبياء في اشتراكهم في علم الغيب المستثنى لهم في آية: {فَلا يُظْهِرُ عَلَى غَيْبِهِ أَحَداً * إِلَّا مَنِ ارْتَضَى مِنْ رَسُولٍ} وقال فيها بعض المفسرين: يريد أو ولي ففيه حذف، لأن الولي وارث لعلم النبوة. اهـ.

Son dövr alimlərindən bir çoxu belə demişdir:

İmam Mənsur əl-Bağdadinin bu mövzuda "İqamətu-şəvahidil-mənqul vəl-məqul, əla ihatəti ilmi Nəbiyyina (sallallahu əleyhi [və alihi] və səlləm)"[136] adlı bir kitabı vardır. Şeyx Əbul-Abbas Əhməd ibn Əbdül-Həyy əl-Hələbi, Sicilmasənin qazisi əllamə, mühəddis Əbdül-Məlik ibn Muhəmməd ət-Təcmuatidən bu məsələ barədə soruşmuş, Təcmuati də ona "Məlakut-tələb və cəvabu ustazil-Hələb"[137] adında xüsusi bir risalə ilə cavab vermişdir. O, burada Peyğəmbərin (sallallahu əleyhi [və alihi] və səlləm) bu beş şeyi bildiyini tam qətiyyətlə bildirmişdir.

Şeyx Əhməd Rza Əli Xan əl-Bəriləvi əl-Hindinin bu mövzuda üç risaləsi vardır: "Milul-ceyb bi-ulumil-ğeyb", "əl-Luluul-məknun fi ilmil-bəşir ma kanə və ma yəkun" və "İnbaul-Mustafa bima usirrə və uxfa". Əllamə Əbu Abdullah Muhəmməd əl-Həbib ibn Əbdül-Qadir əs-Sicilmasi əl-Həsəni, Hilalinin "Mənzumətül-əsmail-hüsna" kitabının şərhində demişdir:

"Biz gərək aşağıdakı səhih hədisə əsasən Peyğəmbərin (sallallahu əleyhi [və alihi] və səlləm) bütün məlumatları bilməmiş bu dünyadan köçmədiyinə etiqad bəsləyək. Həmin hədis belədir: "Mənə bütün şeylərin elmləri verildi, hər bir şey mənim üçün aşkar oldu." Bu hədisə müxalif məzmunda nəql edilən hədislər bu hədis vasitəsilə nəsx olunmuşdur. "**Qeybi bilən Odur və Öz qeybini heç kəsə əyan etməz; Bəyənib seçdiyi peyğəmbərdən başqa!"**[138] ayəsinə əsasən, o Həzrətin qeyb elmi baxımından sair peyğəmbərlərlə müştərək olmasına baxmayaraq, bu hədis vasitəsilə onun qeyb elmi nöqteyi-nəzərdən peyğəmbərlər üzərindəki məziyyəti və elmi üstünlüyü aşkar olur.[139] Bu ayə barədə təfsirçilərdən biri demişdir ki, "Allah-taala "...və ya elçidən başqa" – demək istəyir. Burada "həzf" (silinmə) vardır.[140] Çünki vəli peyğəmbərlik elminin varisidir". Sitatın sonu.

---

136 Tərcüməsi: "Peyğəmbərimizin elminin əhatə dairəsinə dair nəqli və əqli dəlillər".

137 Tərcüməsi: "Bir sualın məğzi və Hələbin ustadının cavabı".

138 "Cinn" surəsi, 256 və 27-ci ayələr.

139 Çünki, bu hədisdə Peyğəmbərin *(sallallahu əleyhi və alihi və səlləm)* bütün elmlərdən agah olduğu bildirilir, keçmiş peyğəmbərlər *(əleyhimussəlam)* isə bu elmlərin hamısından agah olmamışlar. [Müt.]

140 Silinmə dedikdə təhrif nəzərdə tutulmur. Silinmə dedikdə cümlədə nəzərdə tutulub yazıda yazılmayan sözün olması nəzərdə tutulur. [Müt.]

وفي «شرح انموذج اللبيب» للعلامة شمس الدين محمد بن محمد بن عمر الروضي المالكي ما نصه: الصحيح كما قاله المحققون أنه أوتي علم كل شيء حتى الخمسة وحتى علم الروح وأمر بكتم ذلك اهـ.

ونحوه في شرح جوهرة اللقاني لمؤلفها وشرح الأربعين النووية للشبرخيتي وغيرهما , وفي فيض القدير بشرح الجامع الصغير للمناوي في الكلام على حديث خمس لا يعلمهن إلاّ الله .. الخ ما نصه: خمس لا

يعلمهن إلاّ الله على وجه الإحاطة والشمول كلياً , وجزئياً فلا ينافيه إطلاع الله بعض خواصه على كثير من المغيبات حتى من هذه الخمس لأنها جزئيات معدودة وإن كان للمعتزلة في ذلك مكابرة اهـ.

Əllamə Şəmsəddin Muhəmməd ibn Muhəmməd ibn Ömər ər-Raudi əl-Malikinin "Şərhu-unmuzəcil-ləbib" kitabında belə gəlmişdir:

"Araşdırmaçıların da dediyi kimi doğru-düzgün olan budur ki, Peyğəmbərə hər şeyin elmi verilmişdir; hətta beş elm və ruhun elmi də verilmişdir. Lakin ona bunu gizli saxlamaq əmr edilmişdir". **Sitatın sonu.**

"Şərhu cəvhərətil-Luqani" kitabı, Şəbərxitinin "Şərhul-ərbəinən-nəbəviyyə" kitabı və digər kitablarda da buna bənzər söz deyilmişdir. Mənavinin "Feyzül-Qədir" kitabında deyilmişdir:

"...Beş şeyi mütləq və tam şəkildə şəkildə, yalnız Allah bilir. Lakin bu, Allahın bəzi xüsusi bəndələrini bu beş şey də daxil olmaqla bir çox qeybi işlərdən agah etməsi ilə ziddiyyət təşkil etmir. Çünki, (Allahın onlara öyrətdiyi şeylər) bir sıra məhdud sayda cüziyyatdan ibarətdirlər.[141] Buna baxmayaraq, mötəzililər bu məsələdə inadkarlıq edirlər". **Sitatın sonu.**

قلت: والذي أرجحه وأميل إليه أنه صلى الله عليه وآله وسلم لم يعرج من الدنيا حتى علمه الله هذه الخمس لأنه لم يزل يترقى في العلوم والمعارف كل يوم بل كل لحظة وعموم الأحاديث يشهد لذلك منها حديث البخاري عن أسماء بنت أبي بكر أن النبي صلى الله عليه وسلم حمد الله وأثنى عليه ثم قال: «ما من شيء لم أكن أريته قبل إلاّ رأيته في مقامي هذا حتى الجنة والنار»، وهذه الخطبة كانت بالمدينة , ومنها حديث سمرة قال: كسفت الشمس فصلى النبي صلى الله عليه وسلم ثم قال: «إني والله لقد رأيت منذ قمت أصلي ما أنتم لاقوه من أمر دنياكم وآخرتكم»، حديث صحيح رواه أحمد وغيره. ولا ينافيه قوله في حديث الترجمة إلاّ الخمس , لأنه كان قبل أن يعلمها ثم علمها بعد ذلك وهذا كما نهى عن تفضيله على موسى ويونس وإبراهيم عليهم السلام ثم أخبر أنه أفضل الأنبياء ورد على من دعاه سيّداً بأن السيد الله , ثم أخبر أنه سيد ولد آدم وأمره الله تعالى في القرآن أن يقول للكفار {مَا كَانَ لِيَ مِنْ عِلْمٍ بِالْمَلَإِ الْأَعْلَى إِذْ يَخْتَصِمُونَ} ثم أخبر بعد ذلك أن الله أطلعه على خصامهم, ففي حديث ابن عباس ومعاذ وغيرهما عن النبي صلى الله عليه وسلم قال: «رأيت ربي في أحسن صورة فقال يا محمد، قلت: لبيك رب وسعديك , قال: أتدري

---

141 Yəni, Allah qeyb elmini, yaxud bu beş şeyin elmini bütünlüklə onlara öyrətmir, bunlardan, sadəcə bir qismini onlara öyrədir. Bir qismini öyrətdiyinə görə də bu, Allahın mütləq və tam şəkildə qeybi bilməsi ilə ziddiyyət təşkil etmir. [Müt.]

فيم يختصم الملأ الأعلى؟ قلت: لا أدري يا رب , قال: فوضع يده بين كتفي حتى وجدت بردها في صدري فتجلى لي كل شيء وعرفت» وذكر الحديث وهو في سنن الترمذي ومسند أحمد وغيرهما بطرق متعددة، وهو حديث صحيح وقد تكلمت عليه في «قمع الأشرار عن جريمة الانتحار» المطبوع مع «الأربعين الغمارية» وشرحه الحافظ ابن رجب في جزء مطبوع اسمه «اختيار الأولى في شرح حديث اختصام الملأ الأعلى»، وهذا الحديث أحد الأدلة على علمه بالخمس أيضاً , لأن قوله: فتجلى لي كل شيء عام, بل هو أقوى صيغ العموم كما تقرر في الأصول.

"Deyirəm: doğru hesab edib meyl etdiyim nəzər budur ki, Allah Peyğəmbərə (sallallahu əleyhi [və alihi] və səlləm) bu beş elmi öyrətmədən Peyğəmbər dünyadan köçməmişdir. Çünki, Peyğəmbər hər gün, hətta hər an elm və maarif baxımından yüksəlirdi. Hədislər də, ümumilikdə bu mənaya şahidlik edir. Belə hədislərdən biri Buxarinin Əsma bint Əbu Bəkrdən nəql etdiyi hədisdir:

"...Bundan əvvəl görmədiyim nə vardısa, bu əsnada (yəni, namazda olarkən) hamısını gördüm, hətta cənnət və cəhənnəmi belə gördüm".

Bu xütbə Mədinədə olmuşdur. Həmçinin, digər bir hədis Səmurənin hədisidir: "Günəş tutuldu, Peyğəmbər (sallallahu əleyhi [və alihi] və səlləm) namaz qıldı... Sonra dedi: "Allaha and olsun ki, qalxıb namaz qıldığım andan etibarən sizin dünya və axirətdə qarşılaşacağınız bütün şeyləri gördüm." Bu hədis səhihdir. Bunu Əhməd və başqaları nəql etmişlər. Bu hədis yuxarıda qeyd edilən "yalnız beş şeydən başqa..." hədisi ilə ziddiyyət təşkil etmir. Çünki, həmin "beş şey" hədisi Peyğəmbər (sallallahu əleyhi [və alihi] və səlləm) bu beş şeyi bilməmişdən qabaq deyilmiş, sonra isə Peyğəmbər həmin şeyləri bilmişdir. Bu, eynilə Peyğəmbərin özünü Musa, Yunis və İbrahimdən (əleyhimussəlam) üstün tutulmasını qadağan edib, sonra özünün peyğəmbərlərin sərvəri olduğunu bildirməsi; həmçinin, özünü "seyyid" (ağa) deyə çağıran şəxsə "ağa Allahdır", – deyib, sonra isə Adəm övladının ağası olmasını bildirməsi hadisəsi kimidir. Allah-taala Qurani-Kərimdə ona kafirlərə belə deməsini əmr etmişdir: **"Mənim (bundan əvvəl) yuxarı aləm barəsində (oradakı söhbətlər və oranın mələklərinin) bir-birləri ilə (Adəmin yaradılışı haqqında) mübahisə edərkən (danışıqlarından) heç bir məlumatım yox idi"**.[142] Sonra isə xəbər vermişdir ki, Allah onu mələklərin mübahisəsindən xəbərdar etmişdir. İbn Abbasın, Məazın və başqalarının hədislərində belə gəlmişdir:

"Rəbbimi ən gözəl surətdə gördüm. O mənə dedi: "Ey Muhəmməd!"

Dedim: "Ləbbeyk, ya Rəbb!"

Dedi: "Bilirsən yuxarı aləm nə barədə mübahisə aparırdı?"

---

142 Sad surəsi, 69-cu ayə.

Dedim: “Bilmirəm, ya Rəbb”.

Bundan sonra Allah əlini mənim iki çiynim arasına qoydu və mən Onun əlinin soyuqluğunu köksümdə hiss etdim. Bundan sonra hər bir şey mənim üçün təcəlla etdi (aydın oldu) və mən bildim”.

Bu hədis “Sünənut-Tirmizi”, “Müsnədu-Əhməd” və başqa kitablarda müxtəlif sənədlərlə nəql edilmişdir. Bu, səhih hədisdir. Mən “əl-Ərbəunəl-ğimariyyə” kitabı ilə birgə çap olunan “Qəmul-əşrar ən cərimətil-intihar” kitabında bu hədis barədə danışımışam. Bu hədisi Hafiz İbn Rəcəb “İxtiyarul-əvla fi şərhi hədisi-ixtisamil-mələil-əla” kitabında şərh etmişdir. Bu hədis də Həzrətin beş şeyi bildiyinə dəlalət edən hədislərdəndir. Çünki buradakı “hər bir şey mənim üçün aydın oldu” sözü ümumidir. Hətta, bu hədis – üsul elmində də sübuta yetirildiyi kimi – ümumilik ifadə edən formaların ən güclüsüdür”.

قوله في حديث حذيفة قام فينا رسول الله صلى الله عليه وسلم مقاماً ما ترك شيئاً إلى قيام الساعة يعني من الفتن والحوادث وغيرها إلاّ ذكره الحديث, نحوه قول عمر: (قام فينا رسول الله صلى الله عليه وسلم مقاماً فأخبرنا عن بدء الخلق حتى نسيته) رواه البخاري معلقاً بصيغة الجزم ووصله الطبراني, وقال أبو ذر: لقد تركنا رسول الله صلى الله عليه وسلم وما يحرك طائر جناحيه في السماء إلاّ ذكرنا منه علماً, رواه أحمد والطبراني بإسناد صحيح , وكذا قال أبو الدرداء رواه أبو يعلى والطبراني وغيرهما , والله أعلم.

“Hüzeyfənin hədisindəki: “Bir gün Allah Rəsulu (sallallahu əleyhi [və alihi] və səlləm) bizim üçün uzun bir xütbə söylədi və həmin gündən qiyamət gününədək baş verəcək...” – sözünə gəlincə, mənası belədir ki, yəni, qiyamət gününədək baş verəcək bütün fitnələri, hadisələri və s. bizə danışdı. Bunun kimi başqa bir rəvayət də Ömərdən nəql edilmişdir: “Allah Rəsulu (sallallahu əleyhi [və alihi] və səlləm) bizim üçün (uzun müddət) xütbə edərək yaradılışın başlanğıcından xəbər verdi, lakin mən onu unutdum.” Bunu Buxari və Təbərani nəql etmişlər. Əbu-Zər isə demişdir:

“Allah Rəsulu (sallallahu əleyhi [və alihi] və səlləm) bizə, hətta səmada iki qanadını hərəkət etdirən (səmada qanad çalan) quşdan da danışdı.” Bu hədisi Əhməd və Təbərani səhih sənədlə nəql etmişlər. Əbüd-Dərda da belə demişdir. Onu Əbu Yəla, Təbərani və başqaları nəql etmişlər. Allah daha yaxşı bilər”.[143]

Allah Rəsulunun *(sallallahu əleyhi və alihi və səlləm)* bu geniş elmini onun itrətindən olan pak imamlar *(əleyhimussəlam)* irs aparmışlar. Onlar özlərinin nəql etdikləri kimi,

---

143 “Əl-Əhadisul-muntəqah”, 117-122.

Allahın elminin xəzinədarlarıdırlar. Əllamə Kuleyninin "əl-Kafi" kitabında nəql etdiyi səhih rəvayətdə belə qeyd edilmişdir:

أحمد بن محمد، عن محمد بن عبد الجبار، عن محمد بن خالد، عن فضالة ابن أيوب، عن عبد الله بن أبي يعفور قال: قال لي أبو عبد الله عليه السلام يا ابن أبي يعفور إنّ الله تبارك وتعالى واحدٌ متوحدٌ بالوحدانية متفرّد بأمره، فخلق خلقاً فرّدهم لذلك الأمر، فنحن هم، يا ابن أبي يعفور فنحن حجج الله في عباده، وشهداؤه في خلقه، وأمناؤه وخزّانه على علمه، والداعون إلى سبيله، والقائمون بذلك، فمن أطاعنا فقد أطاع الله

"Əhməd ibn Muhəmməd, Muhəmməd ibn Əbdül-Cabbardan, o, Muhəmməd ibn Xaliddən, o, Füzalə ibn Əyyubdan, o da Abdullah ibn Əbu Yəfurdan belə nəql etmişdir:

"Əbu Abdullah (əleyhissəlam) mənə dedi: "Ey Əbu Yəfurun oğlu, Allah - təbarək və təala - vahiddir (Onun oxşarı və bənzəri yoxdur), yeganə vahid olan Odur. O, öz işində təkbaşınadır.[144] (Bununla yanaşı) bir sıra fərdlər yaradaraq onları bu iş üçün ayırmışdır.[145] Həmin şəxslər bizik. Ey Əbu Yəfurun oğlu, biz Allahın Öz bəndələri arasındakı höccətləriyik, məxluqatı arasındakı şahidləriyik, Onun elminin əmanətdarı və xəzinədarıyıq, Onun yoluna çağıran və Onun yolunda olan şəxslərik. Kim bizə itaət etsə, Allaha itaət etmişdir".[146]



Onlar elmin mədəni və əslidirlər. Əllamə Səffarın nəql etdiyi səhih bir rəvayətdə deyilir:

حدثني العباس بن معروف، قال: حدثنا حماد ابن عيسى، عن ربعي، عن الجارود وهو أبو المنذر قال: دخلت مع أبي على علي بن الحسين بن علي عليه السلام فقال علي بن الحسين: ما تنقم الناس منّا، نحن والله شجرة النبوّة، وبيت الرّحمة، وموضع الرّسالة، ومعدن العلم، ومختلف الملائكة.

"Mənə Abbas ibn Məruf nəql edib dedi: Həmmad ibn İsa bizə Rəbidən, o da Əbül-Münzir Caruddan nəql edib dedi:

"Atamla birlikdə Əli ibn Hüseyn ibn Əlinin (əleyhimussəlam) yanına daxil oldum. Əli ibn Hüseyn (əleyhissəlam) dedi: "Camaatın bizdən niyə xoşu gəlmir? (yaxud: camaat bizi niyə inkar edir?). Allaha and olsun ki, biz nübuvvət

144 "Öz işi" dedikdə, şəriət nəzərdə tutula bilər. Yəni, şəriət qoymaq, şəri hökmləri təyin etmək, yalnız Ona məxsusdur. O, bu işdə təkdir və heç bir kəslə ortaq deyil. (Mazandarani). [Müt.]

145 Yəni, şəriət qoymaq və şəriət təyin etmək işi, yalnız Allaha məxsusdur, lakin Allah bu şəriət və hökmləri bəndələrə izah edib çatdırsınlar deyə, müəyyən şəxslər yaratmışdır. (Mazandarani). [Müt.]

146 "Əl-Kafi", c.1, səh.193; "Bəsairud-dərəcat", səh.75, səhih sənədlə.

ağacıyıq, rəhmət eviyik, risalət yeriyik,[147] elm mədəniyik, mələklərin enib-qalxdıqları məkanıq".[148]

Siqətül-İslam Kuleyni belə nəql etmişdir:

محمد بن يحيى، عن عبد الله بن محمد بن عيسى، عن أبيه، عن عبد الله بن المغيرة، عن إسماعيل بن أبي زياد، عن جعفر بن محمد عن أبيه عليهما السلام قال: قال أمير المؤمنين عليه السلام: إنّا أهل البيت شجرة النبوّة، وموضع الرّسالة، ومختلف الملائكة، ومعدن العلم.

"Muhəmməd ibn Yəhya, Abdullah ibn Muhəmməd ibn İsadan, o, atasından, o, Abdullah ibn Müğeyrədən, o, İsmayıl ibn Əbu Ziyaddan, o Cəfər ibn Muhəmməddən (İmam Sadiqdən) (əleyhissəlam), o da atasından (əleyhissəlam) belə nəql etmişdir:

"Əmirəlmöminin (əleyhissəlam) buyurmuşdur: "Biz Əhli-Beyt nübuvvət ağacıyıq, risalət yeriyik, mələklərin enib-qalxdıqları məkanıq və elm mədəniyik".[149]

Səmaların və yerin xəbərləri onlardan gizli qalmır və elmin mənbələri onların yanındadır. Siqətül-İslam Kuleyninin nəql etdiyi səhih bir rəvayətdə deyilir:

محمد بن يحيى، عن أحمد بن محمد، عن ابن محبوب، عن ابن رئاب، عن ضريس الكناسي قال: سمعت أبا جعفر عليه السلام يقول – وعنده أناس من أصحابه –: عجبت من قوم يتولونا ويجعلونا أئمة ويصفون أن طاعتنا مفترضة عليهم كطاعة رسول الله صلى الله عليه وآله ثم يكسرون حجتهم ويخصمون أنفسهم بضعف قلوبهم، فينقصونا حقنا ويعيبون ذلك على من أعطاه الله برهان حق معرفتنا والتسليم لأمرنا، أترون أن الله تبارك وتعالى افترض طاعة أوليائه على عباده، ثم يخفي عنهم أخبار السماوات والأرض ويقطع عنهم مواد العلم فيما يرد عليهم مما فيه قوام دينهم؟!

فقال له حمران: جعلت فداك أرأيت ما كان من أمر قيام علي بن أبي طالب والحسن والحسين عليهم السلام وخروجهم وقيامهم بدين الله عزّ ذكره، وما أصيبوا من قتل الطواغيت إياهم والظفر بهم حتى قتلوا وغلبوا؟

فقال أبو جعفر عليه السلام: يا حمران إن الله تبارك وتعالى قد كان قدر ذلك عليهم وقضاه وأمضاه وحتمه على سبيل الاختيار، ثم أجراه فبتقدم علم إليهم من رسول الله صلى الله عليه وآله قام علي والحسن والحسين عليهم السلام، وبعلم صمت من صمت منا، ولو أنهم يا حمران حيث نزل بهم ما نزل بهم من أمر الله عز وجل وإظهار الطواغيت عليهم سألوا الله عز وجل أن يدفع عنهم ذلك وألحوا عليه في طلب إزالة ملك الطواغيت وذهاب ملكهم إذاً لأجابهم ودفع ذلك عنهم، ثم كان انقضاء مدة الطواغيت وذهاب ملكهم أسرع من سلك منظوم انقطع

147 Peyğəmbərliyin nazil olduğu yer bizim ailədir. [Müt.]
148 "Bəsairud-dərəcat", səh.71.
149 "Əl-Kafi", c.1, səh.221.

فتبدد، وما كان ذلك الذي أصابهم يا حمران لذنب اقترفوه ولا لعقوبة معصية خالفوا الله فيها ولكن لمنازل وكرامة من الله، أراد أن يبلغوها، فلا تذهبن بك المذاهب فيهم.

"Muhəmməd ibn Yəhya, Əhməd ibn Muhəmməddən, o, İbn Məhbubdan, o, İbn Riabdan, o da Zureys əl-Kunasidən belə nəql etmişdir:

"Əbu Cəfərin (İmam Baqirin) (əleyhissəlam) bir dəstə səhabəsinin yanında belə buyurduğunu eşitdim: "Mən bizi dost tutan, bizi (özünə) imam bilən, itaətimizin Allah Rəsulunun (sallallahu əleyhi və alihi və səlləm) itaəti kimi özlərinə vacib olduğunu deyən, sonra isə qəlblərinin zəifliyinə görə[150] dəlillərini sındırıb öz əleyhlərinə çıxan şəxslərə[151] təəccüb edirəm. Onlar bizim haqqımıza riayət etmirlər.[152] Bu məsələyə görə Allahın bizi layiqincə tanımaq bürhanı əta etdiyi və bizim işimizi qəbul etmək nəsib etdiyi şəxslərə eyib tuturlar.[153] Görəsən, ola bilərmi ki, Allah öz vəlilərinin itaətini bəndələrə vacib etsin, sonra da səmaların və yerin xəbərlərini həmin vəlilərdən gizlətsin?! Görəsən, ola bilərmi ki, Allah öz vəlilərinin itaətini bəndələrə vacib etsin, sonra isə onlara verilən və dinin güclənməsinə səbəb olan (suallar) barəsində elmi onlardan kəssin?![154]

Humran ona dedi: "Sənə fəda olum, bəs səncə Əli ibn Əbu-Talibin, Həsənin və Hüseynin (əleyhimussəlam) qiyam etmələri, Allahın dinini dirçəltmək naminə (zalımlara qarşı) çıxmaları, sonra da tağutların onları qətlə yetirib onlar üzərində qələbə çalmaları, onların da (əleyhimussəlam) məğlub olub qətlə yetirilmələri (necə izah edilməlidir)?"[155]

---

150 "Qəlbələrinin zəifliklərinə görə": yəni, qəlblərində imamı layiqincə tanıma gücü olmadığına görə. (Mazandarani) [Müt.]

151 "Öz dəlillərini sındırıb...": çünki, onların müxaliflər qarşısında höccət və dəlilləri budur ki, onların imamları müxaliflərin imamlarından daha elmlidir. Buna görə də onlar öz imamlarının hər şeyi bilmədiklərini dedikləri zaman höccət və dəlillərini sındırmış olurlar. Çünki, bu zaman müxaliflər deyə bilər ki: "Bizimlə sizin aranızda bir fərq yoxdur, çünki sizin də, bizim də imamımız elmin olub-olmaması baxımından eynidirlər" (Mazandarani). Yaxud, Əllamə Məclisinin dediyi kimi: "...çünki, onların müxaliflər qarşısında höccət və dəlilləri bundan ibarətdir ki, onların imamları müxaliflərin imamlarının bilmədiyi şeyləri bilir, habelə imam elmdə kamil olmalıdır və müxaliflərin imamı naqis və nadandır. Əgər onlar öz imamlarının cahil olduğunu desələr, o zaman öz höccət və dəlillərini sındırmış və batil etmiş olarlar."

"...öz əleyhlərinə çıxan şəxslərə...": yəni, elə kəslərə ki, müxaliflər onların dedikləri həmin sözü əllərində tutsalar, onlara qalib gələrlər. Yaxud imamətlə bağlı iddia etdikləri şeyə müxalif olan söz deyən kəslərə. (Məclisi). [Müt.]

152 Bizim bütün elmləri bildiyimizi inkar edirlər. [Müt.]

153 Yəni, bizi layiqincə tanıyan, bizim tam və kamil elmə sahib olduğumuzu qəbul edən şəxslərə öz mərifətsizlikləri üzündən eyib tutur, tənə vururlar. (Mazandarani, Məclisi). [Müt.]

154 Yəni, ola bilərmi ki, onlara dinin kamilləşməsi və möhkəmlənməsi ilə birbaşa əlaqəsi olan suallar verildiyi zaman bu suallarla bağlı Allah tərəfindən onlara bilgi gəlməsin? Ola bilərmi ki, Allah onları bu cür sualların cavabından məhrum buraxsın? [Müt.]

155 Sanki Humran demək istəyir ki, əgər onların hər şeyə elmləri var idisə və hər şeyi bilirdilərsə, bəs nə üçün qətlə yetirilmələrinə səbəb olan bu işlərə əl atdılar? (Mazandarani). [Müt.]

Əbu Cəfər (əleyhissəlam) buyurdu: “Ey Humran! Allah - təbarək və taala - onlar üçün bu şeyləri ixtiyari yolla[156]müqəddər etmiş, onlar üçün yazmış və qətiləşdirmişdi. Sonra da bu şeyləri həyata keçirdi. Allah Rəsulundan (sallallahu əleyhi və alihi və səlləm) onlara gəlib çatan bir elm səbəbilə Əli, Həsən və Hüseyn (əleyhimussəlam) qiyam etdilər, yenə (Allah Rəsulundan gəlib çatan) bir elm vasitəsilə bizim içimizdə susanlar susdular.[157] Ey Humran! Əgər onlar başlarına gələn həmin hadisələr zamanı, yəni tağutlar onlara qələb çalan zaman Allahdan bu işi onlardan uzaqlaşdırmasını istəsəydilər və tağutların hakimiyyətinin aradan getməsini Allahdan israrla diləsəydilər, şübhəsiz ki, Allah onların istəklərini yerinə yetirər və bu şeyləri onlardan uzaqlaşdırardı. Bundan sonra tağutların müddətlərinin bitməsi və hakimiyyətlərinin aradan getməsi bir boyunbağının qırılıb parça-parça ətrafa səpələnməsindən daha tez olardı. Ey Humran! Onların başlarına gələn bu işlər, nə onların bulaşdıqları bir günaha görə, nə də Allahla müxalifət etdikləri bir üsyanın cəzasına görə idi. Bu işlər məhz Allah yanında olan bir sıra məqamlar və ali dəyərə görə idi ki, Allah onların bu məqamlara çatmasını istədi (və bu səbəbdən də bu hadisələr baş verdi). Onlar barədə batil fikirlərə uymayasan!”[158]

“Bəsairud-dərəcat” kitabında səhih sənədlə belə nəql olunmuşdur:

حدثني يعقوب بن يزيد، عن ابن أبي عمير، عن هشام بن سالم، عن محمد بن مسلم قال: قلت لأبي عبد الله عليه السلام: إنّا نجد الشيء من أحاديثنا في أيدي النّاس، قال: فقال لي: لعلّك لا تدري أنّ رسول الله صلى الله عليه وآله أنال وأنال، ثم أومأ بيده عن يمينه وشماله ومن بين يديه ومن خلفه، [وقال:] وإنّا أهل البيت عندنا معاقل العلم وضياء الأمر وفصل ما بين النّاس.

“Yaqub ibn Yezid mənə İbn Əbu Umeyrdən, o, Hişam ibn Salimdən, o da Muhəmməd ibn Müslimdən belə nəql etdi:

“Əbu Abdullaha (İmam Sadiqə) (əleyhissəlam) dedim: “Biz öz hədislərimizdən bəzi şeyləri camaatın əlində (də) görürük”.

Mənə dedi: “Bəlkə də sən bilmirsən ki, Allah Rəsulu (sallallahu əleyhi və alihi və səlləm) (elmləri camaat arasında) bolluca yaymış və yaymışdır.” Sonra əli ilə sağı,

---

[156] Yəni, baş verən bütün hadisələr onların razılıqları ilə baş vermişdir. Bu şeylərlə bağlı əvvəlcə onlara xəbər verilmiş, bu şeylərin baş verməsini istəyib-istəməməkdə ixtiyar sahibi olduqları bildirilmişdir, onlar da bunların baş verməsini seçmişlər. (Məclisi, həmçinin Mazandarani bu məzmunda başqa söz demişdir (“Şərhu-uusulil-kafi”, c.6, səh.45). [Müt.]

[157] Başqa hədislərdə də bildirildiyi kimi, imamlardan *(əleyhimussəlam)* bəzilərinin qiyam edib digərlərinin etməməsi ilahi göstəriş və əmr əsasında olmuşdur. [Müt.]

[158] “Əl-Kafi”, c.1, səh.261-262; “Bəsairud-dərəcat”, səh.144, səhih sənədlə.

solu, önü və arxasına işarə edib dedi: "Elmin qalaları, iş(lər)in nuru[159] və camaat arasında baş verən şeylərin qəti hökmü biz Əhli-Beytin yanındadır".[160]

Yenə Əllamə Səffar müvəssəq sənədlə belə nəql etmişdir:

حدثنا يعقوب بن يزيد، عن زياد القندي، عن هشام بن سالم قال: قلت لأبي عبد الله عليه السلام جعلت فداك عند العامة من أحاديث رسول الله شيء يصح؟ فقال: نعم، إنّ رسول الله صلى الله عليه وآله أنال وأنال وأنال، وعندنا معاقل العلم وفصل ما بين النآس.

"Yaqub ibn Yezid bizə Ziyad əl-Qəndidən, o da Hişam ibn Salimdən belə nəql etmişdir:

"Əbu Abdullaha (İmam Sadiqə) (əleyhissəlam) dedim: "Sənə fəda olum, müxaliflərin yanında Allah Rəsulunun (sallallahu əleyhi və alihi və səlləm) hədislərindən səhih bir şey var?"

Buyurdu: "Bəli, Allah Rəsulu (sallallahu əleyhi və alihi və səlləm) yaymış, yaymış və yaymışdır. (Lakin) elmin qalaları və camaat arasında baş verən şeylərin qəti hökmü bizim yanımızdadır".[161]

İmamlar *(əleyhimussəlam)* Allahın Kitabına, bütün halal və haramlara, baş vermiş və qiyamətədək baş verəcək bütün şeylərə agahdırlar. Buna dəlalət edən rəvayətlərdən biri Əllamə Səffarın səhih sənədlə nəql etdiyi bu rəvayətdir:

حدثنا محمد بن الحسين، عن صفوان بن يحيى، عن ذريح المحاربي وأحمد بن محمد، عن البرقي، عن صفوان، عن ذريح قال: سمعت أبا عبد الله عليه السلام يقول: إن أبي نعم الأب رحمة الله عليه كان يقول لو أجد ثلاثة رهط أستودعهم العلم وهم أهل لذلك لحدثت بما لا يحتاج فيه إلى نظر في حلال ولا حرام، وما يكون إلى يوم القيامة، إن حديثنا صعب مستصعب لا يؤمن به إلاّ عبدٌ امتحن الله قلبه للإيمان.

Muhəmməd ibn Hüseyn bizə Səfvan ibn Yəhyadan, o, Zureyh əl-Məharibidən, həmçinin Əhməd ibn Muhəmməd, Bərqidən, o, Səfvandan, o da Zureyhdən nəql edib dedi:

"Əbu Abdullahın (İmam Sadiqin) (əleyhissəlam) belə buyurduğunu eşitdim: "Mənim atam nə yaxşı ata idi, Allah ona rəhmət etsin! Əgər elmi yanlarında qoya biləcəyim üç nəfər layiqli adam tapsaydım, (onlara) elə şeylər nəql edərdim ki, heç bir halal və ya haram məsələsində düşünməyə

---

[159] Yəni, bizim dediklərimiz sayəsində işlərin həqiqəti üzə çıxır, bizim sözlərimiz sayəsində qaranlıq işlər (məsələlər) aydınlığa qovuşur. (Əllamə Məclisi). [Müt.]

[160] "Bəsairud-dərəcat", səh.380.

[161] "Bəsairud-dərəcat", səh. 383.

ehtiyac duymazdılar. Həmçinin qiyamət gününədək baş verəcək şeyləri onlara nəql edərdim. Bizim hədisimiz ağırdır və ağır gəlir.[162] Ona yalnız Allahın qəlbini iman üçün imtahan etdiyi bəndə iman gətirər".[163]

Həmçinin səhih sənədlə belə nəql etmişdir:

حدثنا العباس بن معروف، عن حمّاد بن عيسى، عن حريز، عن أبي بصير، عن أبي جعفر عليه السلام قال: سئل علي عليه السلام عن علم النبي صلى الله عليه وآله فقال: علم النبي علم جميع النبيين وعلم ما كان وعلم ما هو كائن إلى قيام الساعة، ثم قال: والذي نفسي بيده إني لأعلم علم النبي صلى الله عليه وآله وعلم ما كان وما هو كائن فيما بيني وبين قيام الساعة.

"Abbas ibn Məruf bizə Həmmad ibn İsadan, o, Hərizdən, o, Əbu Bəsirdən, o da Əbu Cəfərdən (əleyhissəlam) belə nəql etmişdir:

"Əlidən (əleyhissəlam) Peyğəmbərin (sallallahu əleyhi və alihi və səlləm) elmi barədə soruşuldu. Buyurdu: "Peyğəmbər (sallallahu əleyhi və alihi və səlləm) bütün peyğəmbərlərin (əleyhimussəlam) elmlərini bilirdi. O, keçmişdə baş vermiş və qiyamətədək baş verəcək bütün şeyləri bilirdi." Sonra dedi: "And olsun canım əlində olan o Kəsə ki, mən Peyğəmbərin (sallallahu əleyhi və alihi və səlləm) elmini, keçmişdə baş vermiş və bu zamandan qiyamətədək baş verəcək şeyləri bilirəm".[164]

Yenə Əllamə Səffar müvəssəq sənədlə belə nəql etmişdir:

حدثنا محمد بن عبد الجبار، عن الحسن بن علي بن فضال، عن ثعلبة، عن يعقوب بن شعيب، عن أبي عبد الله عليه السلام قال: إنّ الله تعالى علّم رسول الله صلى الله عليه وآله القرآن وعلّمه شيئاً سوى ذلك، فما علّم الله رسوله فقد علّم رسوله صلى الله عليه وآله عليّاً عليه السلام.

"Muhəmməd ibn Əbdül-Cabbar bizə Həsən ibn Əli ibn Fəzzaldan, o, Sələbədən, o, Yaqub ibn Şüeybdən, o da Əbu Abdullahdan (İmam Sadiqdən) (əleyhissəlam) belə nəql etmişdir:

"Allah-taala Allah Rəsuluna (sallallahu əleyhi və alihi və səlləm) Quranı, həmçinin Qurandan başqa bir şey də öyrətmişdir. Allah Öz Rəsuluna (sallallahu əleyhi və alihi və səlləm) nə öyrətmişdirsə, o da həmin şeyi Əliyə (əleyhissəlam) öyrətmişdir".[165]

Yenə Əllamə Səffar səhih kimi sayılan həsən sənədlə belə nəql etmişdir:

---

162 Yəni, öz-özlüyündə ağırdır və başqasına da ağır gəlir (insanlar onu dərk etməkdə çətinlik çəkirlər). [Müt.]

163 "Bəsairud-dərəcat", səh.439.

164 "Bəsairud-dərəcat", səh.131.

165 "Bəsairud-dərəcat", səh.310.

حدثنا أحمد بن محمد، عن الحسين بن سعيد عن فضالة بن أيوب، عن عمر بن أبان وأحمد بن علي ابن الحكم عن عمر ابن أبان، عن أديم أخي أيوب، عن حمران بن أعين قال: قال أبو عبد الله عليه السلام: إن الله تبارك وتعالى علم رسول الله صلى الله عليه وآله الحلال والحرام والتأويل فعلّم رسول الله صلى الله عليه وآله علياً كلّه.

"Əhməd ibn Muhəmməd bizə Hüseyn ibn Səiddən, o, Füzalə ibn Əyyubdan, o da Ömər ibn Əbandan, həmçinin də Əhməd ibn Əli ibn Həkəm, Ömər ibn Əbandan, o, Əyyubun qardaşı Ədimdən (və ya: Udeymdən), o da Humran ibn Əyəndən nəql edib dedi:

"Əbu Abdullah (əleyhissəlam) buyurdu: "Allah - təbarək və taala - Allah Rəsuluna (sallallahu əleyhi və alihi və səlləm) halalı, haramı və təvili öyrətmişdir. Allah Rəsulu (sallallahu əleyhi və alihi və səlləm) da bunların hamısını Əliyə öyrətmişdir".[166]

Yenə Əllamə Səffar səhih sənədlə belə nəql etmişdir:

حدثنا أحمد بن محمد، عن علي بن الحكم، عن هشام بن سالم، عن محمد بن مسلم قال: دخلت عليه بعدما قتل أبو الخطاب ، قال فذكرت له ما كان يروي من أحاديثه تلك العظام قبل أن يحدث ما أحدث، فقال: فحسبك والله يا محمد أن تقول فينا يعلمون الحرام والحلال وعلم القرآن وفصل ما بين الناس، فلمّا أردت أن أقوم أخذ بثوبي فقال: يا محمد وأي شيء الحلال والحرام في جنب العلم، إنّما الحلال والحرام في شيء يسير من القرآن.

"Əhməd ibn Muhəmməd bizə Əli ibn Həkəmdən, o, Hişam ibn Salimdən, o da Muhəmməd ibn Müslimdən belə nəql etmişdir:

"Əbül-Xəttab[167] qətlə yetiriləndən sonra onun[168] yanına daxil oldum. Həzrətə Əbul-Xəttabın bidət çıxarmamışdan qabaq onun hədislərindən böyük (ağır məzmunlu) hədisləri nəql etdiyini dedim.

Həzrət mənə dedi: "Ey Muhəmməd, sənə bizim barəmizdə "onlar haramı, halalı, Quranın elmini və camaat arasındakı (mübahisəli) məsələlərin qəti hökmünü bilirlər", – deməyin kifayət edər."

---

166 "Bəsairud-dərəcat", səh.311.

167 Muhəmməd ibn Miqlas (Əbu Zeynəb) əl-Əsədi əl-Kufi əl-Əcdə (burnu kəsik) əz-Zərrad (zireh düzəldən) əl-Bəzzar (dənli bitkilər satan). Bəzən Əbul-Xəttab, bəzən Əbuz-Zubyan, bəzən də Əbu İsmayıl deyə qeyd olunur. İmam Sadiqin *(əleyhissəlam)* əshabından olmuşdur. İlk əvvəllər doğru yolda və doğru etiqadda olmuş, lakin sonradan çirkin işlər iddia etmişdir. Bu işlərə görə lənətlənmiş və qovulmuşdur. Əvvəlcə özünün vəli, sonra nəbi, sonra rəsul, sonra isə Allahın mələklərindən biri olduğunu və Allahın yer üzünə göndərdiyi elçi olduğunu iddia etmişdir. Onu Xəlifə əl-Mənsurun yaxın silahdaşı İsa ibn Musa Səbxətul-Kufədə (məkan adıdır – red.) qətlə yetirmişdir.

168 Hədisdə Muhəmməd ibn Müslimin hansı İmamı nəzərdə tutduğu qeyd olunmamışdır. Muhəmməd ibn Müslim İmam Baqir, İmam Sadiq və İmam Kazımin *(əleyhimussəlam)* səhabəsi olmuşdur. Lakin, Əbül-Xəttabın İmam Sadiqin *(əleyhissəlam)* əshabından olduğunu və İmam Sadiqin *(əleyhissəlam)* zamanında öldüyünü nəzərə alsaq, hədisdə Muhəmməd ibn Müslimin məhz İmam Sadiqi (əleyhissəlam) nəzərdə tutduğunu deyə bilərik. [Müt.]

Qalxıb getmək istədikdə paltarımdan tutub dedi: "Ey Muhəmməd! Elmin[169] yanında halal və haram nədir ki?! Halal və haram Quranda az bir şeydədi.[170]"[171]

Yenə Əllamə Səffar səhih sənədlə belə nəql etmişdir:

حدثنا يعقوب بن يزيد، عن ابن أبي عمير، عن هشام بن سالم، عن محمد بن مسلم قال: قال أبو عبد الله عليه السلام: بحسبكم أن تقولوا يعلم علم الحلال والحرام، وعلم القرآن، وفصل ما بين النّاس.

"Yaqub ibn Yezid bizə İbn Əbi Umeyrdən, o, Hişam ibn Salimdən, o da Muhəmməd ibn Müslimdən belə nəql etmişdir:

"Əbu Abdullah (İmam Sadiq) (əleyhissəlam) buyurdu: "Sizə, "O, halalın və haramın elmi, Quranın elmi və camaat arasındakı (ixtilaflı şeylərin) qəti hökmünü bilir", – deməyiniz kifayət edər".[172]

Yenə səhih sənədlə belə nəql etmişdir:

حدثنا محمد بن الحسين، عن محمد بن إسماعيل، عن منصور بن يونس، عن ابن أذينة، عن فضيل بن يسار قال: سألت أبا جعفر عليه السلام عن هذه الرواية: ما من القرآن آية إلاّ ولها ظهر وبطن، فقال: ظهره تنزيله وبطنه تأويله، منه ما قد مضى ومنه ما لم يكن يجري كما يجري الشمس والقمر، كلما جاء تأويل شيء منه يكون على الأموات كما يكون على الأحياء، قال الله: {وَمَا يَعْلَمُ تَأْوِيلَهُ إِلَّا اللهُ وَالرَّاسِخُونَ فِي الْعِلْمِ} نحن نعلمه.

"Muhəmməd ibn Hüseyn bizə Muhəmməd ibn İsmayıldan, o, Mənsur ibn Yunisdən, o, İbn Üzeynədən, o da Füzeyl ibn Yəsardan belə nəql etmişdir:

"Əbu Cəfərdən (İmam Baqirdən) (əleyhissəlam) "Quranın bütün ayələrinin zahiri və batini vardır" rəvayəti barədə soruşdum.

Buyurdu: "Quranın zahiri onun tənzili,[173] batini isə təvilidir.[174] Onun[175] bəzisi baş vermiş, bəzisi isə hələ baş verməmişdir. Quran Günəş və Ay kimi hərəkətdədir.[176] Onun hər hansı hissəsinin təvili həyata keçəndə,

[169] Elmin nə olduğu daha öncəki hədislərdə bəyan olundu. [Müt.]

[170] Yəni, Quranın məhdud sayda ayəsində halal və haram bəyan olunmuşdur. [Müt.]

[171] "Bəsairüd-dərəcat", səh.215.

[172] "Bəsairüd-dərəcat", səh.215.

[173] Tənzili: nazil olduğu şəkli, Quranı oxuyarkən ilk başa düşülən məna. Yəni, Quran zahirdə hansı mənada, kimlər barəsində, hansı münasibətlə nazil olubsa, bütün bu şeylər Quranın zahiri sayılır. İmam Baqir (əleyhissəlam) bir hədisdə belə buyurmuşdur: Quranın zahiri Quran kimlər barəsində nazil olubsa (o şəxslərə aiddir), batini isə o şəxslərin əməllərini görən şəxslərə (aiddir). Deməli, Quranın zahiri onun zahirdə başa düşülən mənasıdır, batini isə başqa şəxslərə də aid ola bilər. [Müt.]

[174] Təvil: Ayənin zahirdə başa düşülən yox, batini mənası. [Müt.]

[175] Yəni, Quranın təvilinin və ya Quranın batinində bildirilən şeylərin. [Müt.]

[176] Yəni, Quranın hökmləri zaman və məkan ilə məhdudlaşmır. Quran təkcə 1400 il bundan öncəsinə aid deyil. Quran da Günəş və Ay kimi daim hərəkətdə və yenilənməkdədir. Bu və bunun kimi digər hədisi-

dirilər kimi ölülərə də şamil olur.[177] Allah buyurmuşdur: "**Onun təvilini yalnız Allah və bir də elmdə güclü olanlar bilirlər**". Biz onun təvilini bilirik.[178]"[179]

Əllamə Siqətül-İslam Kuleyni belə nəql etmişdir:

علي بن محمد، عن عبد الله بن علي، عن إبراهيم بن إسحاق، عن عبد الله بن حماد، عن بريد ابن معاوية، عن أحدهما عليهما السلام في قوله الله عز وجل: {وَمَا يَعْلَمُ تَأْوِيلَهُ إِلَّا اللهُ وَالرَّاسِخُونَ فِي الْعِلْمِ} فرسول الله صلى الله عليه وآله أفضل الراسخين في العلم، قد علمه الله عز وجل جميع ما أنزل عليه من التنزيل والتأويل، وما كان الله لينزل عليه شيئاً لم يعلمه تأويله، وأوصياؤه من بعده يعلمونه كله، والذين لا يعلمون تأويله إذا قال العالم فيهم بعلم، فأجابهم الله بقوله: {يَقُولُونَ آمَنَّا بِهِ كُلٌّ مِنْ عِنْدِ رَبِّنَا} والقرآن خاص وعام ومحكم ومتشابه، وناسخ ومنسوخ، فالراسخون في العلم يعلمونه

"Əli ibn Muhəmməd, Abdullah ibn Əlidən, o, İbrahim ibn İshaqdan, o, Abdullah ibn Həmmaddan, o da Büreyd ibn Müaviyədən belə nəql etmişdir:

"İkisinin birindən (ya İmam Baqir, ya da İmam Sadiqdən (əleyhimussəlam)) "**Onun təvilini yalnız Allah və bir də elmdə güclü olanlar bilirlər**" ayəsi barədə soruşdum, buyurdu: "Allah Rəsulu (sallallahu əleyhi və alihi və səlləm) elmdə güclü

---

şəriflər Qurani-Kərimin canlılığını çox gözəl şəkildə ortaya qoyurlar. "Təfsiri-Əyyaşi" kitabında Əbdür-Rəhim əl-Quseyrdən belə nəql olunmuşdur: "Bir gün Əbu Cəfərin *(əleyhissəlam)* yanında idim. Bu zaman o *(əleyhissəlam)* buyurdu: "Ey Əbdür-Rəhim". Dedim: "Ləbbeyk!" Buyurdu: "Allah-taala buyurmuşdur ki, "**Sən məhz qorxudansan, hər bir qövmün isə bir hidayət edəni var.**" Allah Rəsulu *(sallallahu əleyhi və alihi və səlləm)* da buyurmuşdur ki, "qorxudan mənəm, hidayət edən Əlidir." Elə isə bu gün hidayət edən kimdir?" Mən uzun müddət sükut etdim. Sonra başımı qaldırıb dedim: "Sənə fəda olum! Hidayət vəzifəsi sizin aranızdadır. Siz onu bir-birinizdən irs alırsınız. O *(sonda)* gəlib sizə yetişmişdir. Sənə fəda olum, *(bu gün)* hidayət edən sizsiniz!" Buyurdu: "Doğru dedin, ey Əbdür-Rəhim. Quran diridir, ölməmişdir. Ayə diridir, ölməmişdir. Əgər ayə yalnızca *(keçmiş)* qövmlər üçün nazil olsaydı, o zaman onlar öldükləri zaman Quran da ölərdi. Lakin (elə deyil) ayə keçmişdəkilər barədə keçərli olduğu kimi sonrakılar barədə də keçərlidir." ("Təfsirul-Əyyaşi", c.2, səh.204). Bunun kimi başqa bir hədis də Əbu Bəsirdən nəql olunmuşdur. [Müt.]

177 Başqa hədislərdə də sübuta yetdiyi kimi, məsumların *(əleyhimussəlam)* axırıncılarının əvvəlincilərindən daha elmi olmaması üçün bədalıq (qeyri-qəti olan) işlərdə baş verən yeni dəyişikliklər ilk öncə Allah Rəsuluna *(sallallahu əleyhi və alihi və səlləm)* və dünyasını dəyişmiş imamlara *(əleyhimussəlam)*, daha sonra isə zəmanənin imamına bildirilir.

178 Bəlkə də cümlənin daha dəqiq forması "ölülərə şamil olduğu kimi, dirilərə də şamil olur" formasıdır, lakin hədisi nəql edən ravi cümlədə yerdəyişmə etmişdir. Cümlənin mənasına gəlincə, məna Əbdür-Rəhim əl-Quseyridən nəql olunan hədisdəki məna kimidir. Həmçinin, Muhəmməd Baqir Sədr (*Allah ona rəhmət etsin*) buyurmuşdur: "Burada Quranın təvili dedikdə, Quranın öz nazil olduğu dövrdə mövcud olmayan, lakin sonrakı dövrlərdə mövcud olan və baş verən hadisə və məsələlərə uyğunluğu (müvafiqliyi) nəzərdə tutulur. Yəni, Quranda təkcə öz nazil olduğu dövrün hadisələri üçün deyil, həmçinin gələcək dövrlərin hadisələri üçün həll yolları vardır. Quran təkcə öz dövrünün hadisələrinə deyil, həmçinin gələcək dövrün hadisələrinə uyğun və müvafiqdir. Hər dəfə yeni ictimai bir məsələ ortaya çıxdığı zaman Qurani-Kərimin həmin məsələyə müvafiq hökmü və həll yolu olur." [Müt.].

179 "Bəsairud-dərəcat", səh.216.

olanların ən üstünüdür. Allah (Öz Rəsuluna) nazil etdiyi şeylərin hamısının tənzil və təvilini[180] ona öyrədib. Allahın (Öz Rəsuluna) bir şey nazil edib, sonra həmin şeyin təvilini ona öyrətməməsi mümkün deyil. Onun özündən sonrakı vəsiləri də həmin şeylərin (təvillərin) hamısını bilirlər. Quranın təvilini bilməyənlərə gəlincə isə, alim (imam) onların arasında elm (və yəqin) əsasında bir şey dediyi zaman (onlar: "iman gətirdik", - deyərlər). Allah da onlara cavab verərək (onları mədh edərək) buyurmuşdur ki: "**Deyərlər ki, "ona iman gətirdik, hamısı Rəbbimizin dərgahındandır".**[181] Quranın xüsusi və ümumisi, möhkəm və mütəşabehi, nasix və mənsuxu vardır. Elmdə güclü olanlar bunları bilirlər".[182]

Əllamə Səffar səhih sənədlə belə nəql etmişdir:

حدثنا يعقوب بن يزيد، عن محمد بن أبي عمير، عن عمر بن أذينة، عن بريد العجلي، عن أبي جعفر عليه السلام في قول الله تعالى: {وَمَا يَعْلَمُ تَأْوِيلَهُ إِلَّا اللهُ وَالرَّاسِخُونَ فِي الْعِلْمِ} قال رسول الله صلى الله عليه وآله أفضل الراسخين قد علمه الله جميع ما انزل الله إليه من التنزيل والتأويل، وما كان الله لينزل عليه شيئاً لم يعلمه تأويله، وأوصياؤه من بعده يعلمونه كله، والذين لا يعلمون تأويله إذا قال العالم فيه العلم فأجابهم الله: {يَقُولُونَ آمَنَّا بِهِ كُلٌّ مِنْ عِنْدِ رَبِّنَا} والقرآن له خاص وعام ومحكم ومتشابه وناسخ ومنسوخ

"Yaqub ibn Yezid bizə Muhəmməd ibn Əbu Umeyrdən, o, Ömər ibn Üzeynədən, o, Bureyd əl-İclidən, da Əbu Cəfərdən (İmam Baqirdən) (əleyhissəlam) "**Onun təvilini yalnız Allah və bir də elmdə güclü olanlar bilirlər**" ayəsinin təfsiri barədə belə nəql etmişdir:

"Allah Rəsulu (sallallahu əleyhi və alihi və səlləm) elmdə güclü olanların ən üstünüdür. Allah (öz Rəsuluna) nazil etdiyi şeylərin hamısının tənzil və təvilini ona öyrədib. Allahın (öz Rəsuluna) bir şey nazil edib, sonra həmin şeyin təvilini ona öyrətməməsi mümkün deyil. Onun özündən sonrakı vəsiləri də həmin şeylərin (təvillərin) hamısını bilirlər. Quranın təvilini bilməyənlərə gəlincə isə, alim (imam) onun (Quranın) barəsində elm (və yəqin) əsasında bir şey dediyi zaman (onlar: "iman gətirdik", - deyərlər). Allah onlara cavab verərək (onları mədh edərək) demişdir: "**Deyərlər ki, "ona iman gətirdik, hamısı Rəbbimizin dərgahındandır"**. Quranın xüsusi və ümumisi, möhkəm və mütəşabehi, nasix və mənsuxu vardır".[183]

Siqətül-İslam Kuleyni müvəssəq sənədlə belə nəql etmişdir:

---

[180] Yəni, zahiri və batini mənalarını. [Müt.]
[181] Ali-İmran surəsi, 7-ci ayə.
[182] "Əl-Kafi", c.1, səh.213.
[183] "Bəsairud-dərəcat", səh.223.

محمد بن يحيى، عن محمد بن عبد الجبار، عن ابن فضال، عن حماد بن عثمان، عن عبد الأعلى ابن أعين قال: سمعت أبا عبد الله عليه السلام يقول قد ولدني رسول الله صلى الله عليه وآله وأنا أعلم كتاب الله وفيه بدء الخلق، وما هو كائن إلى يوم القيامة، وفيه خبر السماء وخبر الأرض، وخبر الجنة وخبر النار، وخبر ما كان، و [خبر] ما هو كائن، أعلم ذلك كما أنظر إلى كفي، إن الله يقول فيه تبيان كل شيء

"Muhəmməd ibn Yəhya, Muhəmməd ibn Əbdül-Cabbardan, o, İbn Fəzzaldan, o, Həmmad ibn Osmandan, o da Əbdül-Əla ibn Əyəndən belə nəql etmişdir:

"Əbu Abdullahın (İmam Sadiqin) (əleyhissəlam) belə dediyini eşitdim: "Mən Allah Rəsulunun (sallallahu əleyhi və alihi və səlləm) övladıyam. Mən Allahın kitabını bilirəm. Orada yaradılışın başlanması(ndan tutmuş) qiyamətə qədər baş verəcək şeylər (barədə məlumat) vardır. Orada səma və yer, Cənnət və Cəhənnəm, keçmişdə olmuş və gələcəkdə olacaq şeylər barədə məlumat vardır. Mən bunları əlimin içi kimi bilirəm. Allah "**Onda hər bir şeyin açıqlaması vardır**", – deyir".[184]

İbn Əbdül-Bərr demişdir:

حدثني أحمد بن فتح، قال: حدثنا حمزة بن محمد، قال: حدثنا إسحاق بن إبراهيم، قال: حدثنا محمد بن عبد الأعلى، قال: حدثنا محمد بن ثور، عن معمر، عن وهب بن عبد الله، عن أبي الطفيل قال: شهدت علياً رضي الله عنه وهو يخطب ويقول: سلوني فو الله لا تسألوني عن شيء يكون إلى يوم القيامة إلاّ حدثكم به، وسلوني عن كتاب الله، فو الله ما منه آية إلا وأنا أعلم بليل نزلت أم بنهار أم بسهل نزلت أم بجبل...

"Mənə Əhməd ibn Fəth nəql edib dedi: "Bizə Həmzə ibn Muhəmməd nəql edib dedi: "Bizə İshaq ibn İbrahim nəql edib dedi: "Bizə Muhəmməd ibn Əbdül-Əla nəql edib dedi: "Muhəmməd ibn Saur bizə Məmərdən, o, Vəhb ibn Abdullahdan, o da Əbut-Tufeyldən nəql edib dedi:

"Əlinin (əleyhissəlam) xütbə edərək belə dediyinə şahid oldum: "Soruşun məndən! Allaha and olsun ki, qiyamətə qədər baş verəcək hansı bir şeydən soruşsanız, cavab verəcəyəm. Məndən Allahın kitabı barədə soruşun. Allaha and olsun ki, Quranda elə bir ayə yoxdur ki, onun gecə, yoxsa gündüz, düzənlikdə, yoxsa dağda nazil olduğunu bilməyim..."[185]

Əbdür-Rəzzaq əs-Sənani öz təfsirində raviləri siqə (güvənilir) olan bir sənədlə belə nəql etmişdir:

---

[184] "Əl-Kafi", c.1, səh.61; "Bəsairud-dərəcat", səh.218.

[185] "Camiu-bəyanil-ilmi və fadlih", c.1, səh.464, № 726. Kitabın mühəqqiqi Şeyx Əbul-Əşbal əz-Zuheyri demişdir: "**İsnadı səhihdir, raviləri siqədirlər**".

عن معمر، عن وهب بن عبد الله، عن أبي الطفيل قال: شهدت علياً وهو يخطب وهو يقول سلوني، فو الله لا تسألوني عن شيء يكون إلى يوم القيامة إلاّ حدثتكم به، وسلوني عن كتاب الله فو الله ما من آية إلاّ وأنا أعلم بليل نزلت أم بنهار أم في سهل أم في جبل...

"Məmər, Vəhb ibn Abdullahdan, o da Əbut-Tufeyldən belə nəql etmişdir:

"Əlinin (əleyhissəlam) xütbə edərək belə dediyinə şahid oldum: "Soruşun məndən! Allaha and olsun ki, qiyamətə qədər baş verəcək hansı bir şeydən soruşsanız, cavab verəcəyəm. Məndən Allahın kitabı barədə soruşun. Allaha and olsun ki, Quranda elə bir ayə yoxdur ki, onun gecə, yoxsa gündüz, düzənlikdə, yoxsa dağda nazil olduğunu bilməyim..."[186]

İmamlara *(əleyhimussəlam)* kitab elmi verildiyini bildirən rəvayətlər müstəfiz[187] həddədir. Onlardan biri Siqətül-İslam Əllamə Kuleyninin səhih sənədlə nəql etdiyi aşağıdakı hədisdir:

علي بن إبراهيم عن أبيه عن ابن أبي عمير؛ ومحمد بن يحيى عن محمد بن الحسن بن الوليد عمن ذكره عن ابن أبي عمير جميعاً عن ابن أذينه عن بريد بن معاوية قال: قلت لأبي جعفر عليه السلام: {قُلْ كَفَى بِاللهِ شَهِيدًا بَيْنِي وَبَيْنَكُمْ وَمَنْ عِنْدَهُ عِلْمُ الْكِتَابِ} قال: إيّانا عنى، وعلي أولنا وأفضلنا وخيرنا بعد النبي صلى الله عليه وآله

"Əli ibn İbrahim atasından, o da İbn Əbu Ümeyrdən, həmçinin Muhəmməd ibn Yəhya Muhəmməd ibn Həsən ibn Vəliddən, o, bir nəfərdən, o da İbn Əbu Umeyrdən; İbn Əbu Umeyr, İbn Üzeynədən, o da Bureyd ibn Müaviyədən belə nəql etmişdir:

"Əbu Cəfərə (əleyhissəlam) dedim: "**De: "Mənimlə sizin aranızda Allahın və kitab elminə malik şəxsin şahid olması yetər!"[188]** (ayəsində "kitab elminə malik şəxs" dedikdə, Allah kimi nəzərdə tutmuşdur?)"

Buyurdu: "Bizi nəzərə tutmuşdur. Əli (əleyhissəlam) Peyğəmbərdən (sallallahu əleyhi və alihi və səlləm) sonra bizim birincimiz,[189] ən üstünümüz və ən yaxşımızdır".[190]

Əllamə Səffar səhih sənədlə belə nəql etmişdir:

---

186 "Təfsiru-Əbdür-Rəzzaq", c.3, səh.241.

187 Mütəvatir həddindən bir pillə aşağı. [Müt.]

188 "Rəd" surəsi, 43-cü ayə. Səhih dəlillər ayədəki "kitab elminə malik şəxs"in İmam Əli *(əleyhissəlam)* və onun nəslindən olan pak imamlar *(əleyhimussəlam)* olduğunu sübut etdikdən sonra ayədə qeyd edilən "kitab" deyərkən əhli-kitabın kitabı olduğunu demək üçün yer qalmır. Ayədə qeyd edilən kitabdan məqsəd ya mələkut aləminin sirlərini özündə ehtiva edən "lövhi-məhfuz", ya da Əllamə Təbatəbainin dediyi kimi ("Əl-Mizan") Qurani-Kərimdir.

189 "Birincilik" ya zaman baxımındandır, ya da rütbə və şərafət baxımından. (Mazandarani). [Müt.]

190 "Əl-Kafi", c.1, səh.299; "Bəsairud-dərəcat", səh.236, səhih sənədlə.

حدثنا أحمد بن محمد، عن الحسين بن سعيد، عن أحمد بن محمد، عن حمّاد بن عثمان، عن أبي بصير، عن أبي عبد الله عليه السلام قال: سألته عن قول الله عزّ وجل: {قُلْ كَفَى بِاللهِ شَهِيدًا بَيْنِي وَبَيْنَكُمْ وَمَنْ عِنْدَهُ عِلْمُ الْكِتَابِ} أهو علي بن أبي طالب عليه السلام؟ قال: فمن عسى أن يكون غيره

“Əhməd ibn Muhəmməd bizə Hüseyn ibn Səiddən, o, Əhməd ibn Muhəmməddən, o, Həmmad ibn Osmandan, o da Əbu Bəsirdən belə nəql etmişdir:

“Əbu Abdullaha (əleyhissəlam) Allahın “**De: “Mənimlə sizin aranızda Allahın və kitab elminə malik şəxsin şahid olması yetər!”** ayəsi barədə sual verib dedim: “Ayədəki (kitab elminə malik şəxs) Əli ibn Əbu Talibdir (əleyhissəlam)?”

Buyurdu: “Ondan başqa kim ola bilərki?!”[191]

Həmçinin Əllamə Səffar belə nəql etmişdir:

حدثنا عبد الله بن أحمد، عن الحسن بن موسى، عن عبد الرحمن بن أبي نجران، عن المثنى، قال: سألته عن قول الله عزّ وجل: {وَمَنْ عِنْدَهُ عِلْمُ الْكِتَابِ} قال: نزلت في علي عليه السلام بعد رسول الله صلى الله عليه وآله وفي الأئمة بعده.

“Abdullah ibn Əhməd bizə Həsən ibn Musadan, o, Əbdür-Rəhman ibn Əbu Nəcrandan, o da Müsənnadan belə nəql etmişdir:

“Ondan[192] Allahın (əzzə və cəll) “**kitab elminə malik şəxs...**” ayəsi barədə soruşdum, buyurdu: “Allah Rəsulundan (sallallahu əleyhi və alihi və səlləm) sonra Əlinin (əleyhissəlam) barəsində nazil olmuşdur, Əlidən sonra da imamlar (əleyhimussəlam) barədə nazil olmuşdur”.[193]



---

191 “Bəsairud-dərəcat”, səh.235.
192 Ya İmam Sadiq, ya da İmam Kazimdən *(əleyhiməssəlam)*. [Müt.]
193 “Bəsairud-dərəcat”, səh.234.

## İmamların *(əleyhimussəlam)* qeybi bilməsi

Şiə müxaliflərindən olan bir dəstə şəxs belə iddia etmişlər ki, şiələr öz imamlarının Allaha ehtiyac duymadan qeybi bildiklərini iddia edirlər. Bu, şiələrə atılan çirkin iftira və yalandan başqa bir şey deyildir. Şiələr hamılıqla müstəqil şəkildə qeybi bilməyin yalnız və yalnız Allaha məxsus olduğunu demişlər. Bu xüsusiyyət Allahın xüsusiyyətlərindəndir; kimsə bu məsələdə Onunla şərik deyil və Allahdan başqa heç kəs müstəqil şəkildə qeybi bilə bilməz.

Kim şiələrin imamların Allahdan müstəqil şəkildə qeybi bilməsinə etiqad bəslədiklərini iddia etsə, böyük yalan deyərək iftira atmış, şiələrin uzaq olduqları bir şeyi onlara nisbət verməyə çalışmışdır.

Bəli, Əhli-Beyt imamları *(əleyhimussəlam)* bir sıra qeybi işlərdən xəbər vermiş, yalnız qeyb yolu ilə bilən bir çox işlərə vaqif olduqlarını bildirmişlər. Lakin onların bu işləri bilmələri Allahdan müstəqil şəkildə olmamışdır. Əksinə, daha öncə qeyd etdiyimiz yollarla bu işləri onlara məhz qeybi bilən Allah öyrətmişdir. Biz, şiələrə nisbət verilən bu iftiranı puç etmək üçün hörmətli oxucuya şiə alimlərinin bu mövzudakı sözlərini təqdim edirik.

Şeyx Müfid demişdir:

إن الأئمة من آل محمد صلى الله عليه وآله قد كانوا يعرفون ضمائر بعض العباد ويعرفون ما يكون قبل كونه، وليس ذلك بواجب في صفاتهم ولا شرطاً في إمامتهم، وإنما أكرمهم الله تعالى به وأعلمهم إياه للطف في طاعتهم والتمسك بإمامتهم، وليس ذلك بواجب عقلاً ولكنه وجب لهم من جهة السماع.

فأما إطلاق القول عليهم بأنهم يعلمون الغيب فهو منكر بين الفساد لأن الوصف بذلك إنما يستحقه من علم الأشياء بنفسه لا بعلم مستفاد وهذا لا يكون إلاّ الله – عز وجل –، وعلى قولي هذا جماعة أهل الإمامة إلاّ من شذ عنهم من المفوضة ومن انتمى إليهم من الغلاة

"Muhəmməd (sallallahu əleyhi və alihi və səlləm) ailəsindən olan imamlar bəzi bəndələrin qəlblərindən xəbərdar olurdular. Bundan əlavə, bir şeyi həmin şey baş verməmişdən qabaq bilirdilər. Lakin bu, nə onlarda olması vacib olan xüsusiyyətlərdəndir, nə də onların imamlığı üçün bir şərtdir. Allah bunu onlara bir lütf olaraq öyrətmişdir ki, (insanlar) onlara itaət (etsin), onların imamətinə sarılsın(lar).[194] Bu, əqli cəhətdən vacib deyil, lakin nəqli cəhətdən onlar üçün vacib olmuşdur.[195]

---

[194] *"Allah bunu onlara bir lütf olaraq öyrətmişdir ki, (insanlar) onlara itaət (etsin), onların imamətinə sarılsın(lar)."* cümləsinin mənasını belə izah etmək olar ki: bu xüsusiyyətin onlarda olması vacib sayılan xüsusiyyətlərdən deyil. Lakin insanlar onlara itaət etsinlər və onların imamətlərinə sarılsınlar deyə, Allah-taala bu xüsusiyyəti bir lütf olaraq onlara bəxş etmişdir. Çünki insanlar onların ilahi höccət olduqlarını daha qətiyyətli şəkildə qəbul etsinlər deyə, onları qane edəcək bir sıra vasitələrə ehtiyac

Onlar barəsində "qeybi bilirlər", – deməyə gəlincə isə, bu, fəsadı açıq-aşkar ortada olan pis sözdür. Çünki bu şəkildə vəsf olunmağa layiq olan kəs əşyaları (hadisə və məlumatları) əldə edilən elmlə deyil, özü (müstəqil elmi ilə) bilən şəxsdir. Əşyaları özü (müstəqil elmi ilə) bilən kəs isə, yalnız Allahdır. Təkcə şazz[196] fikirlə (imamiyyənin etiqadından) ayrılan müvəffizə və onlara mənsub olan ğulatlar istisna olmaqla, İmamiyyə məzhəbi bütünlükdə mənim dediyim bu sözü deyirlər".[197]

Əllamə Təbərsi şiələri "onlar öz imamlarının qeyb elmini bildiklərini iddia edirlər", - deyə ittiham edən bir şəxsə cavab olaraq demişdir:

إن هذا القول ظلم منه لهؤلاء القوم – يعني الشيعة – ولا نعلم أحداً منهم بل أحداً من أهل الإسلام يصف أحداً من الناس بعلم الغيب، ومن وصف مخلوقاً بذلك فقد فارق الدين، والشيعة الإمامية براء من هذا القول، فمن نسبهم إلى ذلك فا الله فيما بينه وبينهم

"Onun bu sözü şiələrə edilən bir zülmdür. Biz şiələr arasında, hətta müsəlmanlar arasında elə bir nəfər tanımırıq ki, hər hansı bir şəxsin qeyb elmini bildiyini desin. Kim hansısa bir məxluqu bu xüsusiyyətlə vəsf edərsə, dindən çıxmışdır. İmamiyyə şiələri bu sözdən uzaqdırlar. Kim onlara belə bir şey nisbət versə, şiələrlə onun arasında Allah hakimdir".[198]

Həmçinin demişdir:

ولا نعلم أحداً منهم – يعني الشيعة – استجاز الوصف بعلم الغيب لأحد من الخلق، فإنما يستحق الوصف بذلك من يعلم جميع المخلوقات وهذه صفة القديم سبحانه العالم لذاته لا يشركه فيها أحد من المخلوقين، ومن اعتقد أنّ غير الله سبحانه يشركه في هذه الصفة فهو خارج على ملة الإسلام

---

duyulur. Qeybi işlərdən xəbər vermək belə vasitələrin ən yaxşılarındandır. İnsanlar imamların qeybi işlərdən xəbər verdiklərini gördükləri zaman onların digər sıravi şəxslər kimi olmadıqlarını anlayar, beləcə onların vilayətlərini daha tez qəbul edərlər. Bunun məsəli eynilə peyğəmbərlərin *(əleyhimussəlam)* bir sıra qeybi işlərdən xəbər verməsi kimidir. Baxmayaraq ki, qeybi işləri bilmək peyğəmbərliyin əsas şərtlərindən deyil, lakin insanlar peyğəmbərlərə itaət edib onların peyğəmbərliklərini daha tez qəbul etsinlər deyə, onlara bu xüsusiyyət verilir. Allah daha yaxşı bilər. [Müt.]

195 Bəzi şeylərin vacibliyi həm əqli cəhətdən, həm də nəqli cəhətdən sübuta yetir *(məsələn, peyğəmbərlərin (əleyhimussəlam) məsum olmaları kimi. Belə ki, bu xüsusiyyətin onlarda olmasının vacibliyi həm əqli cəhətdən, həm də nəqli cəhətdən sübuta yetmişdir).* Bəzi şeylərin vacibliyi isə əqli cəhətdən deyil, yalnız nəqli cəhətdən sübuta yetir. Şeyx Müfidin də bildirdiyi kimi, imamların *(əleyhimussəlam)* qeybi işlərdən xəbər verməsi vacibliyi məhz nəqli cəhətdən sübuta yetən işlərdəndir. Yəni, əqli baxımdan imamların *(əleyhimussəlam)* bir sıra qeybi işlərdən xəbər verməsi onlarda olması gərəkən vacib xüsusiyyətlərdən sayılmır. Lakin bu xüsusiyyətin onlarda olması nəqli baxımdan *(hədislər baxımından)* sübuta yetdiyi üçün bu xüsusiyyətin onlarda olmasını deməyimiz vacib sayılır. [Müt.]

196 Məşhurun ziddinə olan. [Müt.]

197 "Əvailul-məqalat", səh.67.

198 "Təfsiru-məcməil-bəyan", c.3, səh.447.

"Biz şiələr arasında məxluqatdan hər hansı birini qeyb elmini bilməklə vəsf etməyi caiz bilən bir şəxs tanımırıq. Bu şəkildə vəsf olunmağa yalnız bütün məxluqatı bilən (və tanıyan) kəs layiq ola bilər. Bu xüsusiyyət Qədim olan Allahın zatı sifətidir. O, heç bir məxluqu bu xüsusiyyətə şərik etmir. Kim Allahdan başqa birisinin bu xüsusiyyətdə Onunla müştərək olduğuna etiqad bəsləyərsə, həmin şəxs İslam dinindən xaric olmuşdur".[199]

Əllamə Məclisi demişdir:

اعلم أن الغلو في النبي والأئمة عليهم السلام إنما يكون بالقول بألوهيتهم أو بكونهم شركاء لله تعالى في المعبودية أو في الخلق والرزق أو أن الله تعالى حل فيهم أو اتحد بهم، أو أنهم يعلمون الغيب بغير وحي أو إلهام من الله تعالى أو بالقول في الأئمة عليهم السلام أنهم كانوا أنبياء أو القول بتناسخ أرواح بعضهم إلى بعض أو القول بأن معرفتهم تغني عن جميع الطاعات ولا تكليف معها بترك المعاصي. والقول بكل منها إلحاد وكفر وخروج عن الدين كما دلت عليه الأدلة العقلية والآيات والأخبار...

"Bil ki, Peyğəmbər və imamlar (əleyhimussəlam) barədə ğüluv etmək məhz aşağıdakı hallarda olur: onların ilah olduqları, onların məbudluq, xaliqlik və ya ruzi verməkdə Allahın şərikləri olduqları, yaxud Allahın onların bədənlərinə daxil olduğu və ya onlarla birləşdiyi, yaxud onların Allah tərəfindən vəhy və ya ilham edilmədən (yəni, müstəqil şəkildə) qeybi bildikləri, yaxud imamların (əleyhimussəlam) peyğəmbər olduqları deyildikdə, onların bəzilərinin ruhlarının digərlərinə keçdiyinə (tənasüxə) etiqad bəslədikdə, yaxud onları tanıdıqdan sonra heç bir itaətə ehtiyac olmadığı, ya da onları tanıdıqdan sonra günaha bulaşmağın bir cəzasının olmadığı deyildikdə. Bunlardan hər hansısa birinə etiqad bəsləmək dinsizlik və küfr sayılır. Bunlara etiqad bəsləyən şəxs əqli dəlillər, ayələr və hədislərə əsasən dindən çıxmış olur...."[200]

Əllamə Əbdül-Hüseyn əl-Əmini demişdir:

فالأنبياء والأولياء والمؤمنون كلهم يعلمون الغيب بنص من الكتاب العزيز، ولكل منهم جزء مقسوم، غير أن علم هؤلاء كلهم بلغ ما بلغ محدود لا محالة كمّاً وكيفاً، وعارض ليس بذاتي ومسبوق بعدمه ليس بأزلي، وله بدء ونهاية وليس بسرمدي، ومأخوذ من الله سبحانه وعنده مفاتح الغيب التي لا يعلمها إلاّ هو

"Qurani-Kərimin sübut etdiyinə əsasən, Peyğəmbərlər, vəlilər və möminlər hamısı qeybi bilirlər. Onların hər biri bunu müəyyən həddə bilir. Lakin bu şəxslərin bilgiləri hər nə qədər olsa da, istər kəmiyyət, istərsə də

---

199 "Təfsiru-məcməil-bəyan", c.5, səh.353.

200 "Biharul-ənvar", c.25, səh.346.

keyfiyyət baxımından məhduddur, başqası tərəfindən veriləndir; zati deyil, daha öncə mövcud olmayandır; əzəli deyil, əvvəli və sonu vardır; əbədi deyil, Sübhan olan Allah tərəfindən verilmişdir. Qeybin açarları məhz Onun yanındadır, onları yalnız O bilir".[201]

Şeyx Məhəmmədtəqi Fəlsəfi demişdir:

إن علم الغيب في هذا العالم بأسره يختص به وحده، وإنّ أي موجود آخر أرضياً كان أو سماوياً بشراً كان أو من غير البشر لا علم له بالغيب ولا يمكنه الدخول في هذا المجال المقدس بصورة مستقلة من تلقاء ذاته

"Bu aləmdə qeyb elmi tamamilə Allah-taalaya məxsusdur. Yer üzündə və ya səmada yaşayan bəşər və ya qeyri-bəşər olan heç bir varlıq qeybi bilmir. Heç bir varlıq müstəqil şəkildə öz istəyi ilə bu müqəddəs sahəyə girə bilməz".

Sonra demişdir:

ولكن هناك بعض الأشخاص يحظون – إلى حدٍ ما – بمعرفة بعض الأمور الغيبية وذلك وفقاً لما تسمح به مشيئة الله سبحانه وتعالى وإرادته، وهذا ما نصّت عليه بعض آيات القرآن الكريم: {وَمَا كَانَ اللهُ لِيُطْلِعَكُمْ عَلَى الْغَيْبِ وَلَكِنَّ اللهَ يَجْتَبِي مِنْ رُسُلِهِ مَنْ يَشَاءُ} {عَالِمُ الْغَيْبِ فَلا يُظْهِرُ عَلَى غَيْبِهِ أَحَداً *إِلاَّ مَنِ ارْتَضَى مِنْ رَسُولٍ إذن فالطريقة الأولى للإطلاع على غيب العالم هي أن يأذن الله سبحانه بذلك.

فهناك أشخاص مقربون من الله وأوليائه المنتجبين الكرام تحدّثوا خلال فترة وجودهم في هذه الدنيا عن الأمور الغيبية، وهذا كان بإذن الله سبحانه وتعالى واستناداً إلى الإلهام الرباني.

"Lakin bəzi şəxslər vardır ki, müəyyən həddə qeybi işlərdən xəbərdar olurlar. Əlbəttə bu, Allah-taalanın istəyi və icazəsi ilə olur. Bunu Qurani-Kərimin bəzi ayələri bildirmişdir: "**Allah sizi qeyb sirlərindən xəbərdar edən deyildir. Lakin peyğəmbərlərindən istədiyini seçir (və ona peyğəmbərlik vəzifəsinin ehtiyacı qədər qeyb elmi öyrədir)**".[202] Həmçinin buyurmuşdur: "**O, qeybi biləndir və Öz qeybini heç kəsə əyan etməz; ancaq razı qaldığı elçidən başqa!**"[203]

Deməli, aləmin qeybi işlərindən xəbərdar olmağın birinci yolu Allah-taalanın buna izn verməsidir.

Allahın bir sıra müqərrəb, seçilmiş və möhtərəm vəliləri vardır ki, onlar bu dünyada olduqları müddət ərzində qeybi işlərdən xəbər

[201] "Əl-Ğədir", c.5, səh.53-54.
[202] Ali-İmran surəsi, 179-cu ayə.
[203] Cinn surəsi, 26 və 27-ci ayələr.

vermişlər. Bu, Allah-taalanın izni ilə və Allah tərəfdən gələn ilham vasitəsilə olmuşdur".[204]

Şeyx Məhəmmədcavad Muğniyə demişdir:

إنّ كلمة الغيب لا تدل على معناها فحسب بل تدل أيضاً على أنّ الغيب لله وحده وبالإضافة إلى هذه الدلالة فإنّ أقرب الناس إلى ربّه يعلن للأجيال بأنّه أمام الغيب بشر لا فرق بينه وبين غيره من الناس، ثم لا يكتفي بهذا الإعلان بل يستدل على ذلك بالحس والوجدان وهو أنّه لو علم الغيب لعرف عواقب الأمور

"...Qeyb sözü təkcə bu ayədə[205] deyilən mənaya deyil, həmçinin qeybin yalnız Allaha məxsus olması mənasına da dəlalət edir. Ona görə də Rəbbinə ən yaxın kəs olan Peyğəmbər bütün nəsillər üçün elan edir ki, o, qeybin qarşısında bir bəşərdir, onunla başqa bir insan arasında (bu baxımdan) heç bir fərq yoxdur. Sonra bu elanla da kifayətlənmir, əlavə olaraq bu sözə hiss və vicdan ilə dəlil gətirir; deyir ki, əgər qeybi bilsəydi, onda işlərin sonunu bilərdi".[206]

Sonra deyir:

فلا يكون إخبار الرسول به – بالأمور الغيبية – علماً بالغيب بل نقلاً عمّن يعلم الغيب، والفرق بعيد بين مصدر العلم وبين النقل عن مصدره، لأنّ الأول أصل والثاني فرع

"Allah Rəsulunun (sallallahu əleyhi və alihi və səlləm) qeybi işlərdən xəbər verməsi qeybi bilmək yox, qeybi biləndən nəql etmək sayılır. Elmin mənbəyi ilə elmin mənbəyindən nəql etmək arasında böyük fərq vardır. Çünki birinci əsldir, ikinci şaxədir".[207]

Seyyid Muhəmmədcavad Fəzlullah demişdir:

والواقع الذي لا جدال فيه أنّ علم الغيب من حيث كونه صفة ذاتية مما يختص به سبحانه وتعالى، الذي هو عالم الغيب والشهادة دون أن يشاركه فيه أي موجود مهما كانت منزلته، ومهما كان مقامه، ومعنى علم الغيب هنا هو انكشاف واقع الأشياء ذاتاً دون الحاجة إلى الاستعانة بأي شيء آخر لتحقيق ذلك الانكشاف، ولا يمكن نسبة علم الغيب بهذا المعنى للأئمة فإنه الغلو بل هو الشرك بعينه.

أمّا علم الغيب بمعنى انكشاف الواقع في بعض الحالات للنبي أو الإمام بمعونة من الله لاقتضاء بعض الضرورات الرسالية أو لإظهار تميز النبي أو الإمام عن غيره من البشر الذي ربما يكون في بعض الحالات ضرورة رسالية ملحة فلا

[204] "Əl-Məad beynər-ruhi vəl-cəsəd", c.1, səh.273-274.
[205] Əraf surəsi, 188-ci ayə.
[206] "Əl-Kaşif", c.3, səh.431-432.
[207] "Əl-Kaşif", c.3, səh.433.

نرى أي محالية في نسبته للأئمة بل هو أمرٌ ممكن عقلاً قابلية ووقوعاً، فإذا ثبت إمكانه العقلي ثبت إمكانه الوقوعي بالضرورة.

ويظهر من هذا أنّ الإتهام الظالم الذي ألصقه بعض كتبة التاريخ –من القدماء والمحدثين – بالشيعة من أنهم يعتقدون في أئمتهم علم الغيب [الذي] هو من الصفات المختصة بالله سبحانه وتعالى لا يعدوا كونه تجن مفتعل وتجاوز على الحقيقة.

"Qeybi bilməyin zati sifət olaraq yalnız Allah-taalaya məxsus olması inkaredilməz bir həqiqətdir. Gizlini və aşkarı bilən Odur. Məqam və dərəcəsindən asılı olmayaraq, heç bir varlıq bu məsələdə Onunla şərik deyil. Qeybi bilməyin mənası hər hansı bir yerdən yardım almadan əşyaların həqiqətini öz-özlüyündə (müstəqil şəkildə) bilməkdir. Bu mənada qeyb elmini imamlara nisbət vermək olmaz. Çünki, bu ğüluvdur, hətta xalis şirkdir.

Lakin qeyb elmi dedikdə, bəzi zəruri məsələlərə görə, yaxud peyğəmbər və ya imamın başqa insanlardan fərqli olduqlarını göstərmək məqsədilə (hansı ki, bu iş bəzi hallarda zəruri olur) Allah-taalanın yardımı ilə həqiqətin Peyğəmbər və ya İmam üçün aşkar olması nəzərdə tutulursa, o zaman bu mənada qeyb elminin imamlara nisbət verilməsində heç bir problem görmürük. Bu, əqli və reallaşma cəhətdən mümkün olan bir işdir. Onun əqli baxımdan mümkünlüyü sübuta yetdiyi təqdirdə, reallaşma cəhətdən mümkünlüyü də sübuta yetir.

Bununla aydın olur ki, bəzi qədim və müasir dövr yazıçılarının şiələrə yapışdırdıqları "şiələr imamların Allaha məxsus xüsusiyyətlərdən olan qeybi elmini bilmək xüsusiyyətinə sahib olduqlarını iddia edirlər" – ittihamı, zalım və saxta ittihamdır. Bu söz həqiqəti təhrif etməkdən başqa bir şey deyildir".[208]

Seyyid Əmir Muhəmməd əl-Kazimi demişdir:

ليس في الشيعة من يقول بأنّ الأئمة عليهم السلام يعلمون علم الغيب من عند أنفسهم، ومن ينسب ذلك إليهم فهو مفترٍ عليهم، لأن علم الغيب مخصوص بالله وحده، وإنّما يقولون إنّهم ينبئون عن بعض المغيبات بتعليم الله لهم، وليس في هذا شيءٌ من الغلو وإلاّ كان ماقصه الله تعالى عن نبيّه عيسى عليه السلام بقوله: {وَأُنَبِّئُكُمْ بِمَا تَأْكُلُونَ وَمَا تَدَّخِرُونَ فِي بُيُوتِكُمْ} غلواً باطلاً وهو كفر صراح

"Şiələr arasında "imamlar özləri (müstəqil şəkildə) qeyb elmini bilir" deyən bir şəxs yoxdur. Belə bir şeyi şiələrə nisbət verən kəs onlara iftira atmışdır. Çünki, qeyb elmi yalnız Allaha məxsusdur. Şiələrin dediyi məhz

[208] "Əl-İmamus-Sadiq: xasaisuhu və mumeyyizatuhu", səh.75-76.

bundan ibarətdir ki, imamlar (əleyhimussəlam) Allah-taalanın təlimatı ilə bəzi qeybi işlərdən xəbər verirlər. Bunda ğüluvluq heç bir şey yoxdur. Əks halda Allah-taalanın İsa peyğəmbərdən (əleyhissəlam) nəql etdiyi "**Mən evlərinizdə yediyiniz və yığıb saxladığınız şeyləri sizə xəbər verərəm**"[209] sözü ğüluv və batil söz olardı. Bu isə açıq-aşkar küfrdür".[210]

Seyyid Əbül-Qasim əd-Dibaci demişdir:

إنّ هذه الطائفة – أي الشيعة– تقطع بأجمعها ولا شأن لنا هنا بالغلاة وغيرهم ممن يخرج عن إجماعنا بأن علم الغيب المطلق دون واسطة هو من مختصات الله تبارك وتعالى دون غيره، إلاّ أن ذلك لا يلغي ما نؤمن به وما يؤكده القرآن الكريم والأحاديث الشريفة من إطلاع الله تبارك وتعالى رسوله الكريم صلى الله عليه وآله على المغيبات بواسطة الوحي أو بغيره

"Ğüluv edənləri və onlar kimi icmamızdan xaric olan qrupları istisna etməklə, bu qrup (yəni, şiələr) yekdil olaraq bildirirlər ki, heç bir vasitə olmadan mütləq şəkildə qeybi bilmək yalnızca Allaha məxsusdur. Lakin bu, bizim inandığımız, Quranın və hədislərin vurğuladığı məsələni, yəni Allahın öz elçisini vəyh və ya başqa bir vasitə ilə qeybdən xəbərdar etməsini qüvvədən salmır".[211]

Əllamə Təbatəbai demişdir:

وأما قوله: {قُلْ لا يَعْلَمُ مَنْ فِي السَّمَاوَاتِ وَالأَرْضِ الْغَيْبَ إِلاَّ اللهُ} فلا يدل إلاّ على اختصاص علم الغيب بالذات به تعالى كسائر آيات اختصاص الغيب به، ولا ينفي علم الغير به بتعليم منه تعالى كما يشير إليه قوله: {عَالِمُ الْغَيْبِ فَلا يُظْهِرُ عَلَى غَيْبِهِ أَحَداً * إِلاَّ مَنِ ارْتَضَى مِنْ رَسُولٍ} وقد حكى الله سبحانه نحواً من هذه الأخبار عن المسيح عليه السلام إذ قال: {وَأُنَبِّئُكُمْ بِمَا تَأْكُلُونَ وَمَا تَدَّخِرُونَ} ومن المعلوم أنّ القائل أن النبي عليه السلام كان يخبر الناس بما يكون في نحو لا ينفي كون ذلك بتعليم من الله له. وقد تواترت الأخبار على تفرقها وتنوعها من طرق الفريقين على إخباره صلى الله عليه وآله بكثير من الحوادث المستقبلية

"Allah-taalanın "**De: "Allahdan başqa göylərdə və yerdə olan heç kəs qeybi bilməz!**"[212] sözünə gəlincə, qeyb elminin yalnız Allah-taalaya məxsus olduğunu bildirən digər ayələr kimi, bu ayə də qeyb elminin zati (müstəqil) olaraq yalnız Allaha məxsus olduğuna dəlalət edir. Allah-taalanın təlimatı ilə başqalarının da qeybdən xəbərdar ola bilməsi prinsipi bu ayənin ehtiva etdiyi məzmunla ziddiyyət təşkil etmir. Necə ki, bu

---

[209] Ali-İmran surəsi, 49-cu ayə.
[210] "Muhavaratun əqaidiyyə", səh.32.
[211] "Əl-İmamətu: dirasətun muasira", səh.263.
[212] Nəml surəsi, 65-ci ayə.

ayədə işarə edilmişdir: “**O, qeybi biləndir və Öz qeybini heç kəsə əyan etməz; ancaq razı qaldığı elçidən başqa**”. Allah-taala həzrət Məsihin (əleyhissəlam) də belə bir şey etdiyini[213] nəql etmişdir: “**Mən evlərinizdə yediyiniz və yığıb saxladığınız şeyləri sizə xəbər verərəm**.” Məlumdur ki, Peyğəmbərin (sallallahu əleyhi və alihi və səlləm) sabah baş verəcək şeyləri camaata xəbər verdiyini deyən şəxslər bu işin ona Allah tərəfindən öyrədildiyini inkar etmirlər.

O Həzrətin bir çox gələcək hadisələrdən xəbər verdiyinə dəlalət edən rəvayətlər hər iki məzhəb yolu ilə nəql edilmişdir və bu rəvayətlər mütəvatir həddindədir”.[214]

Şeyx Qulamrza Kardan demişdir:

تعتقد الشيعة الإمامية بأن الله عزّ وجل وحده يعلم الغيب والشهادة، ولا أحد غيره يعلم ذاتاً بشيء، وإنّما علم كل عالم وجميع الكمالات الأخرى وأصحابها مملوكة لله عزّ وجل ولكن قد يُعلم الله عزّ وجل بعض الأشخاص من علمه بحسب المصلحة كما يقول القرآن المجيد: {وَمَا كَانَ اللهُ لِيُطْلِعَكُمْ عَلَى الْغَيْبِ وَلَكِنَّ اللهَ يَجْتَبِي مِنْ رُسُلِهِ مَنْ يَشَاءُ} أو كما في قوله: {عَالِمُ الْغَيْبِ فَلا يُظْهِرُ عَلَى غَيْبِهِ أَحَداً * إِلاَّ مَنِ ارْتَضَى مِنْ رَسُولٍ} فالمستفاد من الآيتين أنّ الله عزّ وجل قد يصطفي أحداً من أنبيائه فيطلعه على الغيب

“İmamiyyə şiələrinin etiqadına görə, yalnız Allah (əzzə və cəll) qeybi və aşkarı bilir. Ondan başqa zati olaraq (müstəqil şəkildə) bir şey bilən kəs yoxdur. Hər bir alimin elmi, bütün digər kamalatlar və onların sahibləri hamılıqla Allahın (əzzə və cəll) mülküdür.[215] Lakin bəzən müəyyən məsləhətlərə əsasən Allah Öz elmindən bəzi şəxslərə öyrədə bilər. Necə ki, Qurani-Məcid deyir: “**Allah sizi qeyb sirlərindən xəbərdar edən deyildir. Lakin peyğəmbərlərindən istədiyini seçir (və ona peyğəmbərlik vəzifəsinin ehtiyacı qədər qeyb elmi öyrədir)**”, yaxud deyir: “**O, qeybi biləndir və Öz qeybini heç kəsə əyan etməz; ancaq razı qaldığı elçidən başqa**”. Bu iki ayədən əldə edilən nəticə budur ki, Allah öz peyğəmbərlərindən birini seçərək onu qeybdən xəbərdar edə bilər”.[216]

Əllamə Seyyid Əli Aşur demişdir:

---

213 Qeybi xəbər verdiyini. [Müt.]
214 “Əl-Mizan”, c.15, səh.393.
215 Bütün elm və kamalatlar (üstün xüsusiyyətlər) Allah tərəfindəndir, Allahdan müstəqil deyildir. [Müt.]
216 “Ər-Rəddu əla şubuhatil-vəhhabiyyə”, səh.15-16.

علم الغيب الذاتي الشخصي وبلا توسط من الغير هذا العلم الثابت لواجب الوجود والذي هو عين الذات وهذا مختص بالله ولغيره كفر. أما العلم بالغيب الذي هو بتوسط الله تعالى وليس هو عين الذات فهذا الذي علمته الأئمة ورسول الله صلى الله عليه وآله

"Heç bir kəsin vasitəçiliyi olmadan (hasil olan), zati və şəxsi, başqa sözlə, vacibül-vucud (Allah) üçün sabit olan və Zatın özü olan qeyb elmi[217] yalnız Allaha məxsusdur. (Bunu) Ondan başqasına nisbət vermək küfrdür.

Allahın vasitəçiliyi ilə olan və Zatın özü sayılmayan qeyb elminə gəlincə isə, imamların (əleyhimussəlam) və Allah Rəsulunun (sallallahu əleyhi və alihi və səlləm) bildiyi qeyb elmi məhz budur".[218]

---

217 "Zatın özü olan...": çünki Allahın elmi Onun zatı ilə eynidir. [Müt.]

218 "Alu-Muhəmməd beynə qəvseyin-nuzul vəs-suud", səh.139.

## İmamlar *(əleyhimussəlam)* qeyb elmini zati şəkildə bildiklərini inkar edirlər

İmamlar *(əleyhimussəlam)* özlərinin zati və müstəqil şəkildə qeybi bildiklərini inkar etmişlər. Onlar bildirmişlər ki, qeybi işlər barədə sahib olduqları məlumatları onlara Allah *(əzzə və cəll)* öyrətmişdir. Şeyx Səffarın "Bəsairud-dərəcat" kitabında nəql etdiyi səhih rəvayətdə belə deyilir:

حدثنا أحمد ابن محمد بن علي بن النعمان، عن ابن مسكان، عن ضريس قال: كنت مع أبي بصير عند أبي جعفر عليه السلام فقال له أبو بصير: بما يعلم عالمكم جعلت فداك؟ قال: يا أبا محمد إن عالمنا لا يعلم الغيب ولو وكل الله عالمنا إلى نفسه كان كبعضكم ولكن يحدث إليه ساعة بعد ساعة

Əhməd ibn Muhəmməd ibn Əli ibn Numan bizə İbn Miskandan, o da Zureysdən belə nəql etmişdir:

"Əbu Bəsirlə birgə Əbu Cəfərin (İmam Baqirin) (əleyhissəlam) yanında idim. Əbu Bəsir ona dedi: "Sənə fəda olum, sizin aliminiz nəyi bilir?"

Buyurdu: "Ey Əbu Muhəmməd, bizim alimimiz qeybi bilmir. Əgər Allah bizim alimimizi özbaşına buraxsaydı, o da sizdən biri kimi olardı. Lakin (elm) onun üçün saatbasaat hasil olur".[219]

Şeyx Kəşşinin nəql etdiyi səhih bir rəvayətdə deyilir:

جعلت فداك إنهم يزعمون أنّك تعلم الغيب فقال: سبحان الله، سبحان الله، ضع يدك على رأسي فو الله ما بقيت شعرة في جسدي ولا في رأسي إلاّ قامت، قال: ثم قال: لا والله ما هي إلاّ رواية عن رسول الله صلى الله عليه وآله

"Həmdəvehy dedi: Yaqub ibn Yezid bizə İbn Əbu Umeyrdən, o da Müğeyrədən nəql edib dedi:

"Mən və Yəhya ibn Abdullah ibn Həsən Əbul-Həsənin (əleyhissəlam) yanında idik. Yəhya dedi: "Sənə fəda olum, onlar[220] sənin qeybi bildiyini iddia edirlər".

O buyurdu: "Sübhanallah! Sübhanallah! Əlini başıma qoy, Allaha and olsun ki, bədənimdə və başımda nə tük varsa biz-biz oldu!"

Sonra dedi: "Allaha and olsun ki, xeyr (elə deyil). (Bizim dediklərimiz) yalnız Allah Rəsulundan (sallallahu əleyhi və alihi və səlləm) olan rəvayətdir".[221]

---

219 "Bəsairud-dərəcat", səh.345.

220 İmamların *(əleyhimussəlam)* zati və müstəqil şəkildə qeybi bildiklərini iddia edən şəxslər ğulatlardır. İmamlar *(əleyhimussəlam)* onlardan bezarlıq etmiş, şiələr də öz imamlarına tabe olaraq bu ğulatlardan, onların sözlərindən və əqidələrindən bezarlıq etmiş, onların kafir olmalarına və dindən çıxmalarına hökm vermişlər.

221 "İxtiyaru-mərifətir-rical", c.2, səh.587.

Şeyx Kəşşinin nəql etdiyi başqa bir səhih rəvayətdə deyilir:

حمدويه قال: حدثنا يعقوب، عن ابن أبي عمير، عن شعيب، عن أبي بصير قال: قلت لأبي عبد الله عليه السلام إنّهم يقولون تعلم قطر المطر وعدد النجوم وورق الشجر ووزن ما في البحر وعدد التراب فرفع يده إلى السماء وقال: سبحان الله، سبحان الله، لا والله ما يعلم هذا إلاّ الله).

"Həmdəvehy dedi: "Yaqub bizə İbn Əbu Umeyrdən, o, Şüeybdən, o da Əbu Bəsirdən nəql edib dedi:

"Əbu Abdullaha (İmam Sadiqə) (əleyhissəlam) dedim: "Onlar deyirlər ki, sən yağışın dənələrini, ulduzların sayını, ağacların yarpaqlarını, dənizdə olan şeylərin çəkisini və torpağın (dənələrinin) sayını bilirsən." Bu zaman o, əlini səmaya qaldırıb dedi: "Sübhanallah! Sübhanallah! Xeyr, vallah! Bunu yalnız Allah bilir".[222]

Həmd aləmlərin Rəbbi olan Allaha məxsusdur. Allahın salavatı olsun məxluqatının ən şərəflisi olan Muhəmmədə və onun pak, mütəhhər ailəsinə!

222 "İxtiyaru-mərifətir-rical", c2, səh.588.